Əbu Hureyrədən (رضى الله عنه)rəvayət edildiyinə görə, Allah Rəsulu (ﷺ) belə buyurmuşdur:

Ramazan (ayı) orucunu bir vəya iki gün (oruc tutmaq) ilə qarşılamayın. Ancaq oruc tutma adəti olan adam, o orucu tutar (tutsun).[1]

İzahı:

İmam Əhməd (رضى الله عنه)və Kütüb-ü sittə sahibləri

Buxari, Muslim, Tirmizi, Əbu Davud, Nəsai, İbn Macə də bu hədisi rəvayət etmişdirlər.

İmam Tirmizi (رحمه الله) bu haqda belə deyir:

Bu hədis, həsən-səhihdir. Elm əhlinin tətbiqatı da bu yöndədir.

Alimlər, Ramazan ayı girmədən əvvəl, Ramazan ayını qarşılamaq niyyəti ilə, müsəlmanların oruc tutmağa tələsməklərini, məkruh saymışlar.

Əgər bir kimsə, oruc tutmağı adət etmiş olub, o gün də onun adətinə rast gələrsə, alimlər, onun oruc tutmağında bir beis görməmişlərdir.”

Hakim (رحمه الله), Beyhaqi (رحمه الله), İbn Hibban (رحمه الله), İbn Xuzeymə (رحمه الله) və Darakutni

1 İbn Macə (رحمه الله): Sünən tərcümə və şərhi, Kitabu’-Siyam: Adət etdiyi oruca rastlayandan başqasının Ramazandan (bir-iki gün) öncə oruc tutmasının qadağan olması haqqında gələn hədislər babı, hədis no: 1650

(رحمه الله) də bu hədisi rəvayət etmişlərdir.

----------------

Not: Həsən-Səhih hədis nə deməkdir? Bu ifadənin istifadə edilməsinin səbəbi budur:

Bu hədisin 2 sənədi olur. Biri həsən, digəri isə, səhih. Belə olan hədis, səhih hədisdən daha qüvvətlidir. Çünkü səhih bir isnadı olduğu kimi, onu qüvvətləndirən həsən bir isnadı da olur.

Müctəhid kimsə, o isnadın səhih və ya həsən olduğu xüsusunda tərəddüd ettiyi üçün, bu təbiri istifadə etmiş olur. Bu təqdirdə, tərəddüdü ifadə edən kəlimə, cümlədən atılmış olur. Çünki təbir belə olmalı idi:

"Bu, həsən və ya səhih bir hədisdir." Təbir, əgər bu mənada istifadə edilmişdirsə, belə olan hədis, səhih hədis qədər qüvvətli sayılmaz.

------------------------

Əl-Mənhəl əsərinin müəllifi isə, Şaban ayının sonunda Ramazan ayını qarşılamaq üzərə oruc tutmağın qadağan edilməsinin hikməti haqqında belə deyir:

Bunun hikməti budur:Ramazan orucuna güclü və rahat olaraq başlamaq üçün, istirahət etmək lazımdır. Oruc isə, bu istirahəti əngəlləyir.

Bəzilərinə görə isə, bunun hikməti:Fərz olan Ramazan orucunun, nafilə oruca qarışmasıdır. Çünki xalq, o kimsənin oruc tutması səbəbi ilə hilalın göründüyünü zənn edərək, oruc tutabilərlər."

Oruc tutmağı adət edən kimsələrin, adətləri yönü ilə, o gün oruc tutmalarının caiz görülməsinin hikməti: Adətinə riayət etməsinə imkan verməkdir. Çünki ibadətin ən fəzilətlisi, az da olsa, davamlı edilənidir. Digər tərəfdən, alışdığı bir şeyi tərk etməsi, insana çətin gəlir.”

Bu hədis, cumhurun dəlilidir. Cumhura görə, oruc tutmağı adət edən kimsələr xaric, Ramazandan öncəki bir və ya iki günə təsadüf edən günlərdə oruc tutmaq, məkruhdur.

Bu görüş: Hz.Ömər (رضى الله عنه), Hz.Əli (رضى الله عنه), Ammar bin Yasir (رضى الله عنه), Huzeyfə (رضى الله عنه) Abdullah bin Məsud (رضى الله عنه)kimi səhabələrdən və Səid b. əl-Museyyeb (رحمه الله), Şabi (رحمه الله), Nəxai (رحمه الله), Həsən əl-Basri (رحمه الله) və İbn Sirin (رحمه الله) gibi tabiunlardan da rəvayət edilmişdir.

Hədis, Ramazandan bir-iki gün öncə oruc tutmağı qadağan etməklə kifayətlənmişdir. Çünki Ramazanı qarşılamaq üçün, əksəriyyət etibarı ilə, Ramazandan bir iki gün öncə oruc tutmaq, istənilə bilər. Bu istəyin ortadan qaldırılması, ön görülmüşdür.

Adəti o günə rastlayan kimsə isə, bu qadağadan istisna tutulmuşdur.

Qəza və kəffarət orucları, alimlərə görə, adət orucu hökmünə tabe tutulmuşdur.



* * *

Əbu Hureyrə (رضى الله عنه) dan rəvayət edildiyinə görə, Rəsulullah (ﷺ) belə buyurdu:

Adəm oğlunun işlədiyi hər yaxşılıq (xeyir və ibadətin mükafatı yönündən) 10 mislindən 700 mislinə, Allahın dilədiyi sayıya qədər artırılar.

Allah Taala buyurur ki: Amma oruc belə deyildir. Çünki oruc Mənim üçündür. Və onun mükafatını mən verərəm. Oruclu kimsə, şəhvətini və yeməyini Mənim üçün tərk edir.

Oruclu üçün 2 sevinc vardır:

Birinci sevinc - iftar vaxtındakı sevincidir.

Digər sevinci də - Rəbbinə qovuşduğu zamandakı sevincidir.

(And olsun ki) oruclunun ağız qoxusu, Allah qatında müşk qoxusundan daha gözəldir.”(1)

Oruc və Ramazan kəlimələri haqqında qısa məlumat:

Savm (Oruc) nə deməkdir?

Savm və siyam kəlimələri, ərəb dilində- tutmaq, susmaq, durğunlaşmaq, özünü əngəlləmək kimi mənalara gəlir.

Şəriətdə isə, fəcrin doğuşundan gün batıncaya qədər xüsusi bir niyyətlə yeməkdən, içməkdən və cinsi münasibətdən özünü tutmaq, əngəlləməkdir.

1 İbn Macə, Sünən tərcümə və şərhi: Orucun fəziləti haqqında gələn hədislər babı, hədis no: 1638)

## ORUC KİTABI

Ramazan nə deməkdir?

Ramazan, ərəbcə bir kəlimədir. Bu aya Ramazan adının verilməsindəki hikmətlər, alimlər tərəfindən belə bildirilmişdir:

1. Yayın sonu payızın əvvəlində yağıb, yer üzünü tozdan təmizləyən yağış mənasına gələn “ramda” kəliməsindən alınmışdır.

Bu yağışın yer üzünü təmizlədiyi kimi, Ramazan da, möminləri günah kirlərindən təmizləyər.

2. Günəşin şiddətli hərarətindən daşların yanıb qızarması mənasına gələn “ramad” kəliməsindən alınmışdır.

Belə qızmar yerdə yeriyənin ayaqları yanar, zəhmət və məşəqqət çəkər.

Bunun kimi də, oruc tutan kimsə də, aclıq və susuzluğun hərarətinə qatlanar, məşəqqət çəkər, içi yanar.

Qızmar yer orada yeriyənlərin ayağını yandırdığı kimi, Ramazan da möminlərin günahlarını yandırar, yox edər.

3. Qılıncın tiyəsini (kəsən hissəsi) vəya ox dəmirini incəldib kəskinləşdirmək üçün zindanın (yanan iki daşın) arasına qoyub döymək mənasına gələn “ramd” dan alınmışdır.

Bu aya Ramazan isminin verilməsi də, ərəblərin bu ayda silahlarını kəskinləşdirib hazırladıqlarından dolayıdır.[1]

---

1 M. Hamdi Yazır, Haqq dini Quran dili, 1. Cild, s. 643-644

Əl-Mənhəl əsərinin müəllifinə görə isə:

4. Ərəblər, ayların isimlərini dəyişdirdikləri zaman, hər ayı, rast gəldiyi fəsilə görə isimləndirirdilər. Ramazan ayı, istiliyin şiddətli olduğu zamana rast gəldiyi üçün, Ramazan adını vermişdilər.

Ramazan orucu hicrətin ikinci ili Şaban ayının üçüncü bazar ertəsi günü fərz qılınmışdır. Ramazan orucunun fərziyyəti, Kitab, sünnət və icma ilə sabitdir. Bundan dolayı, fərziyyətini inkar eden, kafir olur.

Ramazan orucu fərz olmadan əvvəl, Muhamməd ümmətinə hansı bir orucun fərz qılınıb-qılınmadığı xüsusunda, alimlər ixtilaf etmişlərdir.

Əl-Mənhəl əsərinin müəllifi, bu xüsusda verdiyi məlumatın icmalı budur:

Hənəfilərə görə, ilk əvvəl Aşurə günü, yəni Məhərrəm ayının 10-cu günü orucu fərz qılınmış, sonra hər ayın 10 günündən birinin orucla keçirilməsi fərz qılınmış, daha sonra isə, Ramazan orucu fərz qılınınca, zikr edilən orucların fərziyyəti qaldırılmışdır.

Cumhura və Şafii alimlərinin məşhur qövlünə görə, Ramazan orucundan əvvəl, hər hansı bir oruc fərz qılınmamışdır.

Hədisin izahı:

Buxari (رحمه الله) və Muslim (رحمه الله) də bu hədisi rəvayət etmişlərdir. Tirmizi (رحمه الله), Əbu Davud (رحمه الله) və Nəsai (رحمه الله)də bu mənanı ifadə edən



bənzər hədisləri rəvayət etmişlərdir.

Hədis, mömin qulun işlədiyi hər ibadət və xeyirli işin mükafat baxımından ən az 10 qat arttırılacağını, bu artımın 700 qata, hətta daha böyük rəqəmlərə çata biləcəyini müjdələyir.

Bəqara surəsinin 261-ci ayətində də Allah, Öz yolunda xərclənən malın savabının bu şəkildə arttırılacağını müjdələyir:

“Mallarını Allah yolunda sərf edənlərin halı yeddi sünbül verən bir toxuma bənzər ki, bu sünbüllərin hər birində yüz ədəd dən vardır. Allah istədiyi kimsə üçün bunu qat-qat artırır. Allah (lütfü ilə) genişdir.”

Hədis, orucun savabının bu ölçüdən müstəsna olub, çox daha artıq olduğunu hökmə bağlayır. Bu hökmə səbəb olaraq da:

“Çünki oruc Mənim üçündür və onun mükafatını Mən verərəm.” buyurur.

Hədisin bu cümləsinin mənası xüsusunda alimlər fərqli açıqlamalar gətirirlər.

İmam Nəvəvi (رحمه الله), Muslimin Səhihinə yazığı şərhdə, bu hədisin açıqlamasını verərkən icmal olaraq belə deyir:

“Bütün ibadətlər Allah Taala üçün olmaqla bərabər bu hədisdə Allah Taala’nın:

“Oruc Mənim üçündür...” buyurmasının səbəbi xüsusunda alimlər ixtilaf etmişlərdir. Belə ki:

1. Bəzi alimlərə görə, səbəb budur:

Kafirlər bütlərinə namaz, səcdə, sədəqə, zikir və bənzəri ibadət şəkilləri ilə ibadət ettikləri halda, bəşər tarixinin heç bir dövründə, oruc tutmaq surəti ilə ilahlarına ibadət etməmişlərdir. Dolayısı ilə, heç bir dövrdə Allahdan başqa heç bir İlah üçün oruc tutulmamışdır.

2. Namaz, həcc, cihad, sədəqə və digər ibadətlər açıqdan edildiyi üçün riya və göstərişdən tamamən uzaq tutulması çox çətindir. Bu cür ibadətlərdə ixlasın zədələnməsi mümkündür.

Amma oruc, qul ilə Allah arasında gizli qalan bir ibadət olduğu üçün riya və göstərişdən uzaqdır. Sırf Allah rızası üçün edilir.

3. Yemək yeməyə ehtiyac duymamaq, Allah Taala'nın sifətlərindəndir. Qul, oruc tutmaqla Allah Taala'nın bu sifətlərinə sarılmaq istəyər. Amma heç bir şey Allah'ın sifətlərinə bənzəməz.

4. Allah Taala, orucdan başqa ibadətlər qarşısında verəcəyi mükafatı, bəzi qullarına açıqladığı halda, orucun mükafatını bildirməyərək:

"Orucun savabının miqdarını və neçə qat arttırılacağını ancak Mən bilirəm." buyurmuşdur.

5. Orucun qədir və qiymətinin ucalığını və üstünlüyünü ifadə etmək üçün bu ifadə buyurulmuşdur.

Zikr edilən cümlənin sonundakı:

"...və onun mükafatını Mən verərəm..." cümləsi:



Orucun fəzilətinin əzəmətini və savabının çoxluğunu bəyan edir. Çünki Kərim və Comərd bir kəs:

‘Bu mükafatı mən şəxsən verərəm.’

dediyi zaman, veriləcək mükafatın və ehsanın böyük olması gərəkər.”

---------------

Hədisin: “Oruclu üçün 2 sevinc vardır...”cümləsinə gəlincə, İmam Nəvəvi (رحمه الله) belə deyir:

Oruclunun iftarını açdığı zamanki sevincinin səbəbi: Oruc ibadətini tamamlaması, orucu pozan şeylərdən uzaq qalması və orucun uca savabını gözləməsidir.

Oruclunun Allaha qovuşduğu zamanki sevinci’nin səbəbi isə, o anda görəcəyi orucun uca mükafatı və Allahın onu bu ibadətə müvəffəq qılma nemətini xatırlamasıdır.”

Sindi(رحمه الله), oruclunun iftar anındakı sevinc səbəbini açıqlayarkən, İmam Nəvəvi(رحمه الله)‘nin bəyan etdiyi səbəbin yanında, insanın o anda yemək və su ehtiyacını ortadan qaldırmağı bacarması ilə duyduğu təbii sevinci də zikr edərək belə izah gətirənlərin də olduğuna diqqət çəkir.

--------------------

Hədisin: Oruclunun ağız qoxusu, Allah qatında müşk qoxusundan daha gözəldir: cümləsi ilə bağlı olaraq, İmam Nəvəvi (رحمه الله) belə deyir:

Xuluf: ağız qoxusunun pozulmasıdır. Bəziləri bu kəliməni "xaluf" deyə qeyd etmiş isələr də, Xattabi'nin dediyi kimi, bu, xətadır, doğrusu "xuluf"dur.

Bu cümlənin mənası haqqında əl-Maziri (رحمه الله) belə deyir: Bəzi qoxuların gözəlliyi və bundan xoşlanmaq, canlı varlıqların sifətlərindəndir. Onlar, təbiətlərinin meyl ettiyi şeylərdən xoşlanırlar. Təbiətlərinin nifrət ettiyi şeylərdən isə, xoşlanmazlar.

Bu hal, Allah haqqında imkansızdır. Onun üçün bu cümlə, məcazi mənada istifadə edilmişdir. Bundan məqsəd:

Oruc birinin aclığı dolayısı ilə, dəyişən ağız qoxusunun, Allah qatında məqbul və qiymətli olmasıdır.

İmam Qadı İyad (رحمه الله)'ın dediyinə görə, bəziləri belə demişlərdir:

Allah Taala oruclunu, ağız qoxusunun dəyişməsinə qarşılıq, qiyamət günü mükafatlandırar və qiyamətdə onun ağız qoxusu, müşk qoxusundan daha xoş olar. Necə ki, şəhidin qanının qoxusu, müşk qoxusu olar.

Bu qövlə (sözə, görüşə) görə, zikr edilən cümlədən məqsəd:

Bu qoxunun Allahın mələkləri qatındakı xoşluğu, bizim yanımızdakı müşk qoxusunun xoşluğundan üstündür.

İmam Nəvəvi (رحمه الله) sözlərinə davamla belə deyir:

Ən səhih məna, Məğrib alimlərindən əd-Dəravərdi

(رحمه الله)'nin və bəzi dostlarımızın (Şafii alimlərinin) bəyan etdikləri bu mənadır:

Oruclunun ağız qoxusunun pozulması ilə, hasil olan savab, cümələrdə, bayramlarda, hədis və zikir məclislərində və s. xeyirli toplantılarda, yığıncaqlarda məndub (ədəbə uyğun, dinən əmr edilməsə də, gözəl görülən davranış) olan gözəl qoxu və xüsusi ilə də müşk qoxusu istifadə etməkdən əldə edilən savabdan daha çox olmasıdır.

Dostlarımız (Şafii alimləri) bu hədisi dəlil göstərərək, oruclunun zöhrdən sonra misvaq istifadə etməsinin məkruhluğuna hökm etmişlərdir. Çünki misvaq istifadə etmək, fəzilətli isə də, oruc birinin zöhrdən sonra istifadə etməsi, bu hədisdə fəziləti bildirilən qoxunu ortadan qaldırır. Bu qoxunun fəziləti isə, misvaq istifadə etməyin fəzilətindən daha böyükdür.

Necə ki, şəhid qanının qoxusunun gözəlliyi hədislərdə bildirilmiş və bu səbəblə şəhidin cənazəsinin yuyulması tərk edilmişdir.

Halbuki ölünü yumaq, fərzdir. Gözəlliyinə hədislə şəhadət edilən şəhid qanının qalmasını qorumaq üçün fərz olan yuyulma tərk edilincə, gözəlliyinə hədisdə şəhadət edilən oruclunun ağız qoxusunun qorunması üçün vacib olmayan misvaq işini tərk etmək, təbii görülür.

* * *

Əbu Hureyrə (رضى الله عنه)dan rəvayət edildiyinə görə, Allah Rəsulu (ﷺ) belə buyurmuşdur:

Ramazan ayının ilk gecəsi olduğunda, şeytanlar və cinlərin üsyankarları, zəncirlərə vurulur. Cəhənnəmin qapıları bağlanılır, heç bir qapısı açılmaz.

Cənnətin qapıları açılır və heç bir qapısı bağlanmaz və bir nida edici:

Ey xeyirə istəkli kimsə! (xeyir işləməyə) yönəl.

Ey şərrə istəkli kimsə! Özünü tut. Allah tərəfindən atəşdən azad edilənlər olur.deyə səslənir.

Bu (səsləniş və azad edilmə işi) Ramazanın hər gecəsində olur. [1]

---------------------

Tirmizi (رحمه الله), Nəsai (رحمه الله), Hakim (رحمه الله) və ibn Xuzeymə (رحمه الله) də bunu rəvayət etmişdirlər. Buxari (رحمه الله)də, hədisin:

Ramazan gəldiyi zaman Cənnətin qapıları açılır, Cəhənnəmin qapıları bağlanılır və şeytanlar zəncirə vurulur: qismini rəvayət etmişdir.

Tuhfə əsərinin müəllifi, bu hədisin açıqlaması bəhsində belə deyir:

Mərədə: 'Marid'in cəm halıdır. Marid: Şər işləməyə

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu's-Siyam: Orucun fəziləti haqqında gələn hədislər babı, hədis no: 1642)

özünü həsr etmiş kimsəyə deyilir. Cinlərin maridləri, şeytanların bir növüdür.

Şeytanların zəncirlərə vurulmasındakı hikmət, oruclulara vəsvəsə etməmələridir. Bunun bir əlaməti, Ramazandan öncə günahlara dalmış olanların çoxunun, Ramazan orucunu tutmağa başlar-başlamaz, pis vərdişlərini tərk etmələri və Allaha dönmələridir.

Bəzilərində görülən, pislik və üsyana davam etmələrinə gəlincə isə, bunun səbəbi:

Şeytanların təsirinin, bunların içində yaxşıca kökləşmiş olmasıdır.

Bəzi alimlərə görə, şeytanlar zümrəsinin başçısı olan İblis, zəncirə vurulmaz. Çünki Adəm (əleyhissəlam)'a səcdə etməkdən imtina etdiyi zaman, İlahi lənətə məruz qaldığından, Allahdan qiyamətə qədər möhlət istəmiş, Allah Taala da, bu istəyi qəbul etmişdir. Ramazanda baş verən günahlar, Onun vəsvəsə və aldatması ilə meydana gəlir.

Hədisdəki 'bağlanma': azdırmaq və ya aldatmaq xüsusundakı şeytanların zəyif düşürülmələrindən kinayə də ola bilər.

Hafiz İbn Həcər əl-Əsqalani (رحمه الله) nin - Bari'də dediyinə görə: Qadı İyad (رحمه الله) belə deyir:

Şeytanların zəncirlərə vurulmasının həqiqi mənasına görə olması, ehtimal ki, mümkündür.

Şeytanların zəncirlərə vurulması:

Onları möminlərə əziyyət etməkdən uzaq tutmaq və Ramazan ayının girişini və uca qiymətini mələklərə bildirməkdir.

İkinci ehtimal:

İlahi mükafatın çoxluğuna və şeytanların zəncirlərə vurulmuşcasına möminləri günaha bulaştırmalarının azlığına işarətdir. Muslim'in rəvayətindəki:

"Rəhmət qapıları açılar." əlavəsi, bu ikinci ehtimalı, qüvvətləndirir." demişdir.

Daha sonra isə, belə deyir:

Ehtimal ki, Cənnət qapılarının açılması, Allah Taala'nın qulları üçün açdığı ibadətlərdən ibarətdir. Çünki ibadətlər, Cənnətə girmə səbəbləridir.

Cəhənnəm qapılarının bağlanılması da, sahiblərini Cəhənnəmə sövq edən günahlara qarşı, soyuq davranmaqdan ibarətdir.

Şeytanların zəncirlərə vurulması isə: Onların, insanların şəhvətlərini süsləməkdən və aldatmaqdan aciz buraxılmalarıdır.

Əl-Hafiz (رحمه الله) in dediyinə görə, Qurtubi (رحمه الله) hədisin mənasını, zahirinə həml edilməsini (yüklənilməsini) seçdikdən sonra, belə deyir:

"Əgər soruşulsa ki, şeytanlar zəncirlərə vurulmuş olsaydı, Ramazanda günahların və pisliklərin işlənməməsi gərəkərdi. Halbuki görürük ki, çox günah işlənir?!

Buna belə cavab verərik:

Şeytanlar, şərtləri qorunan və ədəbinə riayət edilən oruc ibadətini haqqıyla ifa edən möminlərə qarşı bağlanmış olur. Orucun şərtlərinə və ədəbinə riayət etməyən oruclulara qarşı bağlı deyildir.

Yaxud da deyirik ki, şeytanlardan bir qismi bağlanır.

Necə ki, Tirmizi (رحمه الله) və Nəsai (رحمه الله) nin rəvayəti də buna işarət vardır. Çünki bu rəvayətlərdə: "Marid (asi, üsyankar) şeytanlar..." qeydi vardır.

Belə də deyə bilərik:

Şeytanların bağlanmasından məqsəd, Ramazanda pisliklərin azaldılmasıdır. Bu vəziyyəti çox vaxt müşahidə edirik. Çünki həqiqətən Ramazanda pisliklər, digər aylara nisbətən çox azalır.

Şeytanların hamısının bağlanmış olması, heç bir günahın baş verməməsini gərəktirməz. Çünki pis ruhlu kimsələr, çirkin adətlər və insanlardan olan şeytanlar da möminləri günahlara sövq edərlər."

----------------

Hədisdə "bir nida edici..." buyurulmuşdur.

Tuhfə əsərinin müəllifinə görə:

"Nida edicinin bir mələk olması, ehtimal edilir.

Və ya məqsəd, xeyrə yönəlməsini Allahın iradə etdiyi kimsələrin qəlblərinə, bu hiss və duyğunun girməsidir."

-----------------

Hədisin “Ey şərrə istəkli olan kimsə, özünü tut.” səslənişindən məqsəd:

“Günah işləmək istəyənin, nəfsini günah işləməkdən uzaq tutması və tövbə edib Allaha dönməsidir.”

Əl-Mirkat’da bildirildiyi kimi,

• günah işləyənlərin Ramazanda tövbə etmələri;

• ibadətə qarşı tənbəl davrananların Ramazanda ibadətə sarılmaları;

• saleh insanların Ramazanda ibadətlərini çoxaltmaları,

hədisdəki nida edicilərin təsiri və Allahın rəhmət baxışı ilə ola bilər.

Buna görədir ki, kiçiklər də daxil, müsəlmanların əksəriyyətinin oruc tutduqlarını görərsən. Hətta namaz qılmayanların çoxunun  Ramazanda oruca başladıqları görülür. Halbuki, oruc, namazdan daha çətindir. İbadətə qarşı tənbəlləşməyi gərəktirən vücud zəyifliyinə və artıq yuxuya yol açar. Bununla bərabər məscidlərin Ramazanda camaatla ihya edildikləri (ibadətlə keçirilməsi) görülür.

Hədis, Allah Taala’nın Ramazan ayında Cəhənnəmə layiq (vəya qazanmış) qulların bir qismini, Cəhənnəmdən azad etdiyinə dəlalət edir. Azad edilənlərin çoxluğu, başqa rəvayətlərdən anlaşılır.

Hədisin son cümləsindəki: ‘bu’ kəliməsi, hədisdəki səslənişə işarət edə bilər. Bu təqdirdə cümlənin mənası belə olur:

“Nida edici Ramazanın hər gecəsində, hədisdə bildirilən şəkildə səslənir.”

Zikr edilən kəlimə, azad edilməyə də işarət edə bilər. Bu təqdirdə cümlənin mənası:

“Ramazanın hər gecəsində Allah, çox sayda qullarını Cəhənnəm atəşindən azad edər.” olur.

Zikr edilən “bu” kəliməsinin anılan 2 şeyə də işarət etməsi mümkündür. Buna görə, Ramazanın hər gecəsində səslənilir və azad edilənlər olur.

Sindi (رحمه الله), son ehtimala görə izah gətirmiş, İmam Suyuti (رحمه الله) ikinci ehtimalı seçmiş, Tiybi isə, ilk 2 ehtimala görə izah gətirmişdir.

* * *

Kim inanaraq və sırf Allah razılığını diləyərək Ramazan orucu tutar və iqamə edərsə, onun keçmiş günahları bağışlanar.[1]

Malik (رحمه الله), Buxari (رحمه الله), Muslim (رحمه الله), Tirmizi (رحمه الله), Əbu Davud (رحمه الله), İbn Macə (رحمه الله), Nəsai (رحمه الله) və Beyhaqi (رحمه الله) də bunu bənzər sözlərlə rəvayət etmişlərdir.

Hədisin احتساب (ihtisəbən) kəliməsi:

Hər növ riya və göstərişdən uzaq və tam bir ixlasla Allahın razılığını diləyərək deyə izah edilmişdir.

--------------

Hədisin: "Ramazan orucunu tutar..." cümləsindən məqsəd, Ramazan ayı boyunca oruc tutmaqdır. Üzrsüz olaraq, Ramazanın bir gününü belə orucsuz keçirən kimsə üçün, zikr edilən savab yoxdur.

Üzrdən dolayı, oruc tuta bilməyib, tuta bilmədiyi günləri qəza edən və ya şər'i (şəriətə aid) hökmlər çərçivəsində fidyəsini ödəyən kimsə isə, zikr edilən savabı qazanır. Eynilə ayaqda dura bilmədiyi üçün oturaraq namaz qılan kimsə kimi. Çünki buna ayaqda namaz qılanın savabı vardır.

-----------------

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu İqamətu's-Sala: Ramazan ayı Kıyamı (=təravihlə ihyası) haqqında gələn (hədislər) babı, hədis no: 1326

İqamə etmək (qiyam): Ramazan gecələrini ibadətlə ihya etmək və ya təravih namazını qılmaq deməkdir. Bu babda rəvayət edilən hədislərdə keçən kəlimə və bundan törəyən fellərin sözlük mənası: qalxmaq, ayaqda durmaq və düzəlmək kimi işlərdir.

Burada qəsd edilən mənaya gəlincə isə, alimlərin çoxu, bunu, təravih namazını qılmaq mənasında anlamışlardır.

Bəziləri də bunu Ramazan gecələrini ibadət və itaətlə ihya etmək mənasına yorumlamışlardır.

İmam İbn Həcər əl Əsqalani(رحمه الله), Fəthu’l-Bari’də:

İmam Nəvəvi (رحمه الله), qiyamı təravih namazı qılmaqla açıqlamışdır. İmam Nəvəvi (رحمه الله)nin məqsədi, təravih namazını qılmaqla Ramazan qiyamı və bunun üçün vəd edilən savabın hasil olduğunu ifadə etməkdir.

İmam Nəvəvi (رحمه الله), Ramazan qiyamının təravih namazından başqa ibadətlərlə meydana gələ bilməyəcəyini söyləmək istəməmişdir. Belə bir məqsədi yoxdur.

Amma əl-Kirmani (رحمه الله), bunu təəccüblə qarşılayaraq belə məlumat verir:

“Alimlər, Ramazan qiyamı ilə təravih namazının qəsd edildiyi xüsusunda ittifaq etmişlərdir.”

Hədisdəki qiyam kəliməsi, qeydsiz olaraq keçtiyinə görə, bu kəliməni mütləq mənaya yorumlamaq, yəni Ramazan gecələrini ibadət və itaətlə ihya etmək diyə

açıqlamaq daha uyğundur, deyən alimlər var. Əl-Mənhəl əsərinin müəllifi də buna tərəfdardır.

Alimlərin çoxu Ramazan qiyamını təravih namazını qılmaq şəklində açıqladıqları üçün hədisləri tərcümə edərkən, qiyamı, təravih namazını qılmaq diyə tərcümə etmək mümkündür. Ancaq bu kəlimənin, Ramazan gecələrini ibadətlə ihya etmək deyə də tərcümə edilməsi də mümkündür.

--------------

Hədisin zahirinə görə, iman və ixlasla Ramazan orucunu tutub gecələrini ibadətlə ihya edənin, keçmiş kiçik, böyük bütün günahları bağışlanır. Əl-Mənhəl əsərinin müəllifinə görə, İbnu'l-Munzir (رحمه الله) belə hökm etmişdir.

Ancaq İmam Nəvəvi, Muslim'in şərhində belə deyir:

Fəqihlərcə bilinən məşhur görüş, bu hökmün kiçik günahlara məxsus olub böyük günahlara şamil olmamasıdır.

Bəzilərinə görə, əgər kiçik günahı yoxdursa, böyük günahların cəzası xəfiflədilir."

Ramazan gecələrini ihya etməkdən məqsəd, gecənin bütününü ibadətlə keçirtmək deyildir. Məqsəd, gecənin bir qismibi ibadətlə keçirtməkdir.

Necə ki, qiyamı təravihlə açıqlayanların görüşünə görə, təravih namazını qılan kimsə, gecəni ihya etmiş sayılır.

* * *

Şeytanın hiylə və tələlərini qullarından uzaqlaşdırıb, şeytanın onlara yönəlmiş arzu və ümidlərini boşa çıxararaq, onlara böyük nemətlər ehsan edən Allaha həmd olsun.

Çünki O, orucu, dostları üçün bir qala və qalxan etmiş, orucla onlara Cənnətin qapılarını açmış, onlara şeytanın qəlblərinə gizli arzular vasitəsi ilə təsir edəcəyini və işarət edilən gizli arzuların, şəhvətlərin köklərinin qazılmasıyla mutməinnə nəfsinin düşməninin belini qırıb ona qarşı açıq bir qalibiyyət qazanacağını bildirmişdir.

Məxluqatın lideri, sünnətin qurucusu- Muhammməd (ﷺ) ilə onun kəskin bəsirət və üstün ağıl sahibi yaxınlarına və səhabələrinə rəhmət olsun.

Peyğəmbərin (ﷺ): -''Oruc, səbrin yarısıdır.'' sözləri ilə;

yenə Allah Rəsulunun (ﷺ): - "Səbir, imanın yarısıdır." ifadələri gərəyi,oruc, imanın 1/4-ni meydana gətirdiyi kimi;

Allaha nisbət edilmək özəlliyi ilə də digər İslam rükünlərindən fərqli bir ayrıcalığı vardır. Çünki Allah Taala, peyğəmbərinin özündən nəql etdiyi bir hədisdə belə buyurmuşdur:

Hər yaxşılıq 10 qatından 700 qatına qədər yüksəlir. Yalnız oruc buna daxil deyildir. Çünki oruc Mənə aiddir və onu Mən mükafatlandıraram.

Bir ayətdə isə, Allah Taala belə buyurur: Yalnız səbr edənlərə, əcirləri sonsuz olaraq veriləcəkdir. (Zümər/10)

Oruc isə, səbrin yarısıdır.

Oruclu kimsəyə mükafat, düşünülə və riyazi olaraq rəqəmlərlə ifadə edilə bilməyəcək şəkildə verilər. Ona yaraşanı da budur. Çünki oruc, yalnız Allah üçün edilən ibadətdir.

Bəli, bütün ibadətlər Allah üçün edilir. Ancaq necə ki, bütün yer üzü Allahın mülkü olmasına rəğmən, Kəbə Özünə nisbət edilərək "Allahın evi" ünvanını almış isə, ibadətlər içində də sadəcə oruc, Allaha isnad edilmək surəti ilə belə bir üstünlük payına sahib qılınmışdır.

Orucun bu xüsusiyəti 2 səbəbdən qaynaqlanır:

1. Oruc, arzuları cilovlamaq və yeyib içməməkdir. Bu cəhətdən oruc, görülən yanı olmayan gizli bir ibadətdir. Halbuki oruc xaricindəki bütün ibadətləri, başqalarının görməsi mümkündür. Orucu görən yalnız və yalnız Allahdır. Bir başqa ifadə ilə oruc, sırf səbrə dayanan gizli bir ibadətdir.

2. Oruc, Əziz və Cəlil Allah'ın düşmənini qəhr edən bir ibadətdir. Çünki şeytanın azdırma vasitələri- şəhvətlərdir. Şəhvətlərin güc qaynağı isə, yemək və içməkdir. Bunun üçün Peyğəmbər (ﷺ) belə buyurmuşdur:

Qanın dolaşması kimi, şeytan da insan oğlunun vücudunda dolaşır. Elə isə, onun dolaşdığı bu yolları, aclıqla daraldın.

Yenə bundan ötürü Peyğəmbər (ﷺ) Hz.Aişə (radiyallahu anha)'ya:

-”Cənnətin qapısını döyməyə davam et.” deyincə, Aişə soruşdu:

-”Nə ilə?”

Allah Rəsulu (ﷺ) belə cavab verdi:

-”Aclıqla.”

Bəli, xüsusi ilə oruc,

• şeytanı təsirsizləşdirdiyi,

• giriş yollarını tıxadığı və

• təsir sahələrini daraltdığı üçün

Allah Taala’ya özəlliklə nisbət edilmə haqqını əldə etmişdir.

Çünki Allah düşmənini təsirsiz hala gətirmək, Allaha (Onun dininə) kömək etmək deməkdir. Allaha (Onun dininə) kömək edənin isə, Ondan kömək görəcəyi şübhəsizdir. Çünki O belə buyurur:

Ey iman gətirənlər! Əgər siz Allaha (Onun dininə) yardım göstərsəniz, O da sizə yardım göstərər və sizi sabitqədəm (düşmənlərinizə qarşı möhkəm, qüvvətli) edər. (Muhamməd surəsi/ 7-ci ayət)

Demək ki, işin başında qul, əlindən gələni edəcək və bundan sonra Əziz və Cəlil Allahdan hidayət, doğru yola çatma mükafatını gözləyəcək. Bundan ötürüdür ki, Allah Taala bir ayətində belə buyurur:

“Uğrumuzda cihad edənləri, əlbəttə yollarımıza götürərik.” (Ənkəbut/69)

## ORUC KİTABI

Allah Taala belə buyurur:

Hər hansı bir tayfa öz tövrünü (nəfsində olanları) dəyişmədikcə (pozmadıqca), Allah da onun tövrünü (onda olanları, onun əhvalını) dəyişməz.

Əgər Allah hər hansı bir qövmə bir pislik yetirmək istəsə, onun qarşısı heç cür alına biməz və Ondan başqa onların heç bir hamisi də olmaz." (Rad surəsi/11-ci ayət)

İnsanların mənfi mənada pozulması, dəyişilməsi, şeytanların otlaqları və yaylaqları olan şəhəvi istəkləri arxasından qaçmaları, hər keçən gün bunu artırmalarıdır.

Şəhvətlər bol və yayğın olduqca, oralardan ayaqlarını kəsməzlər, buralara davam etdiyi müddətcə də Allahın əzəmət və cəlalı qula təcəlli etməz və Allah ilə görüşməkdən məhrum qalar. Bunun üçün peyğəmbər (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

"Şeytanlar, Adəm oğulların qəlbləri üzərində dolaşmasalardı, göylərin gizliliklərini seyr edərlərdi."

Bax bu cəhətlərdən, oruc, ibadətlərin qapısı və bir qalxan olaraq dəyərləndirilmişdir.

(Hüccətü'l-İslam İmam Ğazzali, İhya'u-Ulumi'd-din, 1. Cild, 6. Kitab: Orucun sirləri, s. 545-548)

* * *

Əbu Səid əl-Xudri (رضى الله عنه) ‘dan rəvayət edildiyinə görə, Rəsulullah (ﷺ) belə buyurmuşdur:

Kim Allah yolunda bir gün oruc tutarsa, Allah, o günün orucu ilə, cəhhənəm atəşini, onun vücudundan 70 il uzaqlaştırar.

----------------

Əbu Hureyrə (رضى الله عنه) ‘dan rəvayət edildiyinə görə, Rəsulullah (ﷺ) belə buyurmuşdur:

Kim Allah yolunda bir gün oruc tutarsa, Allah, onun vücudunu cəhhənəm atəşindən 70 il uzaqlaştırar.[1]

----------------

İzahı:

Əbu Səid (رضى الله عنه) hədisini, İmam Buxari (رحمه الله), İmam Muslim (رحمه الله) və İmam Nəsai (رحمه الله) də rəvayət etmişlərdir.

Əbu Hureyrə (رضى الله عنه)‘ın hədisini, İmam Nəsai (رحمه الله) rəvayət etmişdir.

----------------

Hədislərdəki: “...Allah yolunda...” ifadəsindən məqsəd, cihad halı qəsd edilmiş ola bilər. Lakin bu da var ki, döyüşdə düşmənə qarşı daha güclü olmaq üçün, oruc tutmamaq, daha fəzilətlidir.

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): Allah yolunda bir gün oruc tutmaq haqqında gələn hədislər babı, hədis no: 1717-1718)

Əgər bu ifadə, bu mənada izah edilərsə, belə cavab veriləcək:

“Oruc tutmaqla zəif düşən qazinin oruc tutmaması və orucdan təsirlənməyən qazinin tutması, fəzilətlidir.”

“...Allah yolunda...” ifadəsi, sırf Allah rizası və ixlaslı mənasında da izah edilə bilər.

----------------

Xarif: bu kəlimənin mənası, payız fəsli deməkdir. Hədisdə, “il” mənasında istifadə edilmiştir.

Yəni 70 illik məsafə cəhənnəmdən uzaqlaşdırılır. Bu ifadə, çox uzaqlaşdırılmadan kinayədir.

* * *

Rəbia b. əl-Ğaz (رضى الله عنه)‘dan rəvayət edildiyinə görə:

O, Rəsulullah (ﷺ)’in nafilə oruc halını Aişə (radiyallahu anha)’dan soruşmuş, Aişə (radiyallahu anha) da belə demişdir:

O, ən əvvəl bazar ertəsi və cümə axşamı (günləri) orucunu arzulayardı.

----------------

Əbu Hureyrə (رضى الله عنه) rəvayət edildiyinə görə:

Rəsulullah (ﷺ), bazar ertəsi və cümə axşamları oruc tutardı. Peyğəmbər (ﷺ) ‘ə:

Ey Allahın Rəsulu! Sən bazar ertəsi və cümə axşamı oruc tutursan’ deyə (bunun) hikməti soruşuldu. O (ﷺ), belə buyurdu:

Bazar ertəsi və cümə axşamı günləri, Allah Taala hər müsəlmana məğfirət edər. Küsülü olanlar müstəsna. Allah:

Küsülü olan bu iki şəxs barışıncaya qədər, onları burax.’ buyurur.[1]

----------------

İzahı:

Bazar ertəsi və cümə axşamı günləri orucunun fəzilətinə dair ilk hədisi, Tirmizi (رحمه الله) də rəvayət etmişdir.

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): ‘Bazar ertəsi və Cümə axşamı günləri orucu babı’, hədis no: 1739-1740

Bu hədisdə keçən "taharri": ən layiqini və ən uyğununu tələb etməkdir. Bir qövlə görə, savab istəmək və bir şeyi normasından artıq bir istəklə tələb etməkdir.

İkinci hədis, Darimi (رحمه الله) tərəfindən də rəvayət edilmişdir. Tirmizi də bunun bir qismini rəvayət etmişdir. Tirmizi'dəki rəvayət belədir:

Rəsulullah (ﷺ) buyurdu ki:

"Əməllər, bazar ertəsi və cümə axşamı günləri (Allaha) ərz edilər. Mən, oruclu ikən əməlimin ərz edilməsini sevərəm."

İmam Əbul Həsən əs-Sindi əl-Hənəfi (رحمه الله) belə deyir:

Əməllərin bu 2 gündə Allaha ərz edildiyi hədislərlə sabitdir. Mənə elə gəlir ki, əməllər ərz edildiyi zaman, Allah müsəlmanlara məğfirət edər. Bu məğfirətdən, məşru (şəriətə, dinə uyğun) bir səbəb yox ikən bir-birilə küsülü olanlar, istifadə edə bilməzlər.

Din uğrunda və ya ailə fərdlərinin ədəbləndirilməsi üçün küsülü qalmaq, caizdir. Belə bir səbəbə bağlı olaraq başqasına küsənlər, o məğfirətdən yararlanarlar.

--------------

Küsülü olanlar haqqında, Allah Taala:

"Bunları barışıncaya qədər burax..." buyurur.

1) Allah'ın xitab etdiyi kəs, əməlləri ərz edən mələk ola bilər. Bu təqdirdə: "...burax..." əmrindən məqsəd, onların əməllərini ərz etməməkdir.

2) Belə də ola bilər:

Allah birinə məğfirət etdiyi zaman, mələk onun xətalarını örtər və ya dəftərindən silər. Bu ehtimala görə “... burax...” əmrindən məqsəd, belələrin günahlarını örtmək və ya silmək işini burax, deməkdir.”

--------------

Sual edilsə ki:

Əməllərin hər gün sabah və axşam Allah’a yüksəldiyinə dair hədislər mövcuddur. Halbuki siz, bu hədislərlə, əməllərin Allah’a ərz edilməsini, sadəcə bazar ertəsi və cümə axşamına xas qıldınız?!

Cavab olaraq deyərik ki:

Zikr etdiyimiz hədislər, əməllərin sabah və axşam yüksəldildiyinə dair hədislərə tərs düşmür. Çünki yüksəldilmək və ərz edilmək başqa-başqa şeylərdir.

Bununla bərabər, əməllərin Şaban ayında yüksəldildiyinə və ya ərz edildiyinə dair hədislərə də tərs düşməz.

Çünki: Həftəlik əməllərin- zikr edilən (1-ci və 4-cü) günlərdə;

İllik əməllərin də- Şaban ayında cəm halda ərz edilməsi mümkündür.

* * *

Əbu Hureyrə (رضى الله عنه) ‘dan rəvayət edildiyinə görə, Allah Rəsulu (ﷺ) belə buyurmuşdur:

Hər şeyin bir zəkatı vardır. Bədənin zəkatı da, orucdur.

Ravi (hədisi rəvayət edən) Muhriz, öz rəvayətində Peyğəmbər (ﷺ) in:

“ Oruc, səbrin yarısıdır”- buyurduğunu da əlavə etmişdir.[1]

---------------

İzahı:

Bu hədisi, İmam Taberani (رحمه الله), Sehl b. Sa’d (radiyallahu anh)’dan rəvayət etmişdir.

Sindi (رحمه الله)bu hədisin açıqlaması bəhsində belə deyir:

Yəni insan, hər şeydən bir miqdarını Allah üçün çıxarmalıdır. Çıxarılan miqdar, o şeyin zəkatı olur. Bədənin zəkatı da orucdur. Çünki bədən, Allah yolunda tutulan orucla nöqsanlaşır. Artıq bədəndən əksilən miqdar, sanki bədənin zəkatı olmaq üzərə, Allah rızası üçün bədəndən çıxarılmışdır.

Əl-Hafni (رحمه الله) isə, Camiu’s-Sağir haşiyəsində, hədisə belə izah gətirir:

---

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kirabu’s-Siyam: ‘Oruc, bədənin zəkatıdır.’ haqqındakı bab, hədis no: 1745

Yəni zəkat, malı təmizlədiyi kimi, oruc da bədəni təmizləyir. Görünüşdə nöqsanlıq vermək kimi görsənsə də, bərəkət və daha çox fayda təmin etmək və ya daha çox şey qazandırmaq yönündən oruc, zəkata bənzətilmişdir.

* * *

Əbu Hureyrə (رضى الله عنه) ‘dan rəvayət edildiyinə görə, Peyğəmbər (ﷺ) belə buyurmuşdur:

Şükür edən orucsuz, səbr edən nafilə oruclu mövqeyindədir.

---------------

Peyğəmbər (ﷺ) ‘in səhabələrindən biri olan Sinan b. Sennə əl-Əsləmi (رضى الله عنه) ‘dan rəvayət edildiyinə görə Allah Rəsulu (ﷺ) belə buyurmuşdur:

Şükr edən orucsuza, səbr edən nafilə oruclunun savabının misli vardır.

Not: Zəvaid’də belə deyilmişdir: Bunun isnadı səhih olub ricalı məvsuq (güvənilən) kimsələrdir.

İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): ‘Şükür edən orucsuz, səbr edən nafilə oruclu kimidir’ deyən haqqındakı bab, hədis no: 1764, 1765

---------------

İzahı:

Əbu Hureyrə (رضى الله عنه)‘ın hədisini, Əhməd (رحمه الله), Tirmizi (رحمه الله) və Hakim (رحمه الله) də rəvayət etmişlərdir. Sinan (رضى الله عنه) ‘ın hədisini Əhməd (رحمه الله) də rəvayət etmişdir.

İmam Əbul Həsən əs-Sindi əl-Hənəfi(رحمه الله)belə deyir:

“Yəni nafilə oruc tutmayıb qidasını alan və gücünü Allah’a itaət yolunda xərcləyən mömin, aclığa və susuzluğa dözərək nafilə oruc tutan kimidir. Çünki ikisi də insan oğlunun yaradılış məqsədi olan- Allah Taala’ya itaət yolundadırlar.

İkinci hədisin zahirinə görə, ikisinin savabı eynidir. Lakin məqsəd bu ola bilər:

Səbr edən oruclu savab qazandığı kimi, itaət və ibadətə güclü olaraq yönəlmək məqsədi ilə nafilə oruc tutmayan da savab qazanır.”

Camiu’s-Sağir şarihi (şərh edəni) əl-Azizi (رحمه الله) də:

Hüccətü’l-İslam İmam Ğazzali (رحمه الله)demişdir ki:

“Səbr ilə şükürdən hansının daha fəzilətli olduğu xüsusunda alimlər ixtilaf etmişlərdir. Bəzilərinə görə, şükür, səbirdən daha fəzilətlidir. Bəziləri, bunun əksini söyləmişdir. Bəzilərinə görə, səbir ilə şükür, fəzilət nöqtəsindən bərabərdir.”

* * *

Əbu Hureyrə (رضى الله عنه)'dan rəvayət edildiyinə görə, Allah Rəsulu (ﷺ) belə buyurmuşdur:

3 sinif insan vardır ki, duası Allah qatında rədd olunmaz:Adil dövlət başçısının; iftar edincəyə qədər oruclunun; və məzlumun duası.

Allah məzlumun duasını, qiyamət günündəki buludun üstünə yüksəldər, göy qapıları ona açılar və Allah Taala:

İzzətimə and olsun ki, ey məzlum kimsə! Bir müddət sonra belə olsa, sənə mütləq yardım edəcəm - buyurur.(1)

---------------

İzahı:

Bu hədisi Tirmizi (رحمه الله) və Hakim (رحمه الله) də rəvayət etmişlərdir.

Camiu's-Sağir şərhində əl-Azizi (رحمه الله)'nin dediyinə görə, bəzi rəvayətlərdə:

"iftarını açıncaya qədər..." ifadəsi yerinə, "iftarını açdığı zaman..."" ifadəsi mövcuddur.

İlk ifadəyə görə, oruclunun gündüzün hansı vaxdında olursa olsun, duası məqbuldur.

İkinci ifadəyə görə isə, oruclu iftarını açdığı zaman və ya iftar açma vaxdı girdiyi zaman edəcəyi dua məqbuldur.

---

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu's-siyam (Oruc kitabı): Oruclunun duası rədd edilməz (haqqındakı) bab, hədis no: 1752)

Sindi (رحمه الله) isə, ilk ifadənin, ravilərdən (hədisi rəvayət edənlərdən) birisinin yanılması olduğunu; və ikinci ifadənin doğru olduğunu müdafiə edərək, bundan sonra gələcək hədisi (1753 no-lu hədis), buna haqlı səbəb olaraq göstərmişdir. (Bu hədis və izahını paylaşacağıq.)

Əl-Alqami'nin nəqlinə görə, əd-Demiyri belə demişdir:

Oruclunun dünya və axirət xoşbəxtliyi üçün özünə, sevdiklərinə və müsəlmanlara dua etməsi, müstəhəbdir. Çünki bu hədis və (bundan sonra gələn) Abdullah (رضى الله عنه) 'ın hədisi, oruclunun xüsusilə iftar vaxtındakı duasının məqbul olduğuna dəlalət edər.

---------------

Məzlumun duası isə, zülümdən qurtulmaq və ya zalım əleyhində ola bilər. Hədisin sonu bunu göstərir.

İmam Əbul Həsən əs-Sindi əl-Hənəfi (رحمه الله)'nin dediyinə görə, hədisdəki "əl-ğamam bulud" kəliməsi ilə Furqan surəsinin 25-ci ayətindəki 'ğamam' qəsd edilmişdir:

وَيَوْمَ تَشَقَّقُ السَّمَآءُ بِالْغَمَامِ وَنُزِّلَ الْمَلٰئِكَةُ تَنْزِيلاً

"Göyün (yeddi qat səmanın yuxarısından enən ağ) buludla parçalanacağı, mələklərin bölük-bölük (yerə) endiriləcəyi gün"

Hədis, məzlumun duası üçün göy qapılarının açıldığını xəbər verir. Göy qapıları, duanın Ərşə yüksəldilmə-

si üçün açılır. Bu açılış, duanı daşıyan mələk üçün ola bilər. Və ya duanın geçişi üçün ola bilər.

Hədis, Allahın məzlum kimsəyə mütləq kömək olduğunu, onu nəzərindən uzaq tutmayacağını, ancaq bir hikmət üçün köməyini gecikdirməsini bildirir.

* * *

Abdullah b. Amr b. əl-As (رضى الله عنه)‘dan rəvayət edildiyinə görə, Allah Rəsulu (ﷺ) belə buyurmuşdur:

Şübhəsiz, hər oruclu üçün iftarını açdığında rədd edilməyən bir dua vardır.

İbn Əbu Muleykə (رحمه الله) demişdir ki: Abdullah b. Amr b. əl-As (رضى الله عنه)‘ın iftarını açdığı zaman, bu duayı oxuduğunu özündən eşitdim:

“اللهم إنى أسئلك برحمتك التى وسعت كل شىء أن تغفر لى”

Allahummə, inni əsəlukə bi rahmətikəlləti vəsiət kulli şəy in ən təğfirali

Allahım, hər şeyi əhatə edən rəhmətin haqqı üçün, mənə məğfirət etməni Səndən istəyirəm.(1)

---------------

İzahı:

İsnadı səhihdir. Çünki Nəsai (رحمه الله), ravi İshaq b. Ubeydullah b. əl-Haris’in zərərsiz olduğunu söyləmişdir. Əbu Zur’a (رحمه الله)da: O, siqadır (güvənilləndir). İbni Hibban (رحمه الله) da onu siqalar arasında zikr etmişdir.

Bu hədis, oruclunun iftar vaxtındakı duasının məqbul olduğuna dəlalət edir. Camiu’s-Sağir haşiyəsində əl-Hafni (رحمه الله) belə deyir:

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): Oruclunun duası rədd edilməz (haqqındakı) bab, hədis no: 1753

Yəni fərz və ya nafilə orucun hər günü, iftar vaxtında, oruclunun edəcəyi dua məqbuldur. Ya arzusu eynilə yerinə gələr və ya ona başqa mükafat verilər. Artıq oruclu:

Dua etdim, amma qəbul olmadı deməməlidir.

İmam Münavi (رحمه الله)isə, belə deyir: Oruclunun iftar vaxdındakı duasının qəbulu, bu ümmətə məxsusdur.

İmam Əbul Həsən əs-Sindi əl-Hənəfi(رحمه الله) də, İmam Suyuti (رحمه الله) ‘dən nəqlən bəyan etdiyinə görə, Tirmizi (رحمه الله) bunları deyir: Həzrət Muhamməd (ﷺ) ‘in ümməti, bütün ümmətlər içərisindən seçilərək duası məqbul qılınmışdır. Allah Taala bu ümmətə xitabən:

“اُدْعُونٖى اَسْتَجِبْ لَكُمْۜ”

Mənə dua edin ki, sizə cavab verim... (Ğafir/60) buyurmuşdur.

Bu vəd, əvvəlki ümmətlərdə yalnız peyğəmbərlərə vardı. Bu ümmətə də verildi. Amma şəhvətlər onların qəlblərinə hakim olub işləri qarışmağa başladığında, vəziyyət dəyişdi.

Oruc isə, nəfsi şəhvani hiss və hərəkətlərdən uzaq tutar. Şəhvət qəlbdən çıxınca qəlb pak və dua qəbula daha layiq olar.

Oruclunun istədiyi şey, onun üçün müqəddər (təqdir edilmiş) isə, sürətlə verilir; deyilsə, axirət azuqəsi olaraq onun üçün saxlanılar.”

* * *

Abdullah b. Amr b. əl-As (radiyallahu anh)'dan rəvayət edildiyinə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

"Allaha ən sevimli oruc, Davud (əleyhissəlam)'ın orucudur. Çünki o, bir gün oruc tutar, bir gün iftar edərdi.

Və Allaha ən sevimli (nafilə) namaz, Davud (əleyhissəlam)'ın namazıdır. O, gecənin yarısını yatardı. 1/3-ini namazla keçirərdi və (son) 1/6-ini yatardı."

---------------

Əbu Qatadə (radiyallahu anh)'dan rəvayət edildiyinə görə, o, belə demişdir:

Ömər b. Xattab (radiyallahu anh):

-"Ey Allahın rəsulu! (Mütəmadiyən) 2 gün oruc tutan və bir gün orucu buraxan kimsənin halı nədir?" diyə soruşdu.

Allah rəsulu (sallallahu aleyhi və səlləm):

-"Buna kimsənin gücü çatar (mı?)" buyurdu.

Ömər:

"- Ey Allahın rəsulu! (Mütəmadiyən bir gün oruc tutub bir gün buraxanın halı necədir?" diyə soruşdu.

Allah rəsulu (sallallahu aleyhi və səlləm):

"-Bu, Davud (əleyhissəlam)'ın orucudur." buyurdu.

Ömər:

“-(Mütəmadiyən) bir gün oruc tutub 2 gün tutmayanın halı necədir?” diyə soruşdu.

Allah rəsulu (sallallahu aleyhi və səlləm):

“-Bunun, gücüm daxilində qılınmış olmasını arzu edirəm.”

(İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): “Davud (əleyhissəlam)’ın orucu haqqında gələn hədislər babı”, hədis no: 1712-1713)

---------------

İzahı:

Abdullah (radiyallahu anh) hədisini, Buxari, Muslim, əbu Davud və Nəsai də rəvayət etmişlərdir.

Bu hədis, nafilə orucun fəzilətcə ən üstününün- il boyunca gün aşırı tutulan oruc- olduğuna dəlalət edir.

Bununla bərabər, gecə namazının ən fəzilətlisinin, gecəni 6 hissəyə bölüb, 4-cü və 5-ci hissəsində qılınan namaz olduğuna dəlalət edir. Son 6-cı hissəsi, istirahətlə keçirilməlidir. Ta ki, gümrah şəkildə sabah namazına dura bilinsin.

Əbu Qatadə (radiyallahu anh) hədisini, Muslim, əbu Davud, Nəsai və Beyhaqi də rəvayət etmişlərdir. Bəzi rəvayətlər isə, çox uzundur.

Hədis, il boyunca, 2 günü orucla və 1 gün orucsuz keçirmənin savab olduğuna, ancaq bunun çətin olduğuna və bu səbəblə, ən məqbul oruc şəklinin, gün aşırı oruc tutmaq olduğuna dəlalət edir. Bu cür oruc, il boyunca ara vermədən oruc tutmaqdan daha fəzilətlidir.

Çünki davamlı oruc tutulduğu təqdirdə vərdiş meydana gəlir. Və aclığın çətinliyi, çox da hiss edilmir. Lakin gün aşırı tutulduğunda, vərdiş halı yaranmır.

Allah rəsulu (sallallahu aleyhi və səlləm) iki gün oruc tutub bir gün tutmamağa, taqəti olmadığını bildirmişdir.

Əl-Mənhəl müəllifinin bəyanına görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm), ümmətinin halı etibarı ilə, bu cümləni buyurmuşdur. Yoxsa, özünün gücü, buna artıqlaması ilə yetərdi. İmam Subqi əl-Mənhəl’də belə deyir:

“Mənə elə gəlir ki, ümmətinə çətinlik olmasın deyə, O, belə oruc tutmağı üsul olaraq mənimsəməmişdi. Çünki Özü bunu etsəydi, sünnətinə tabe olmaq üzərə, ümməti də bunu edəcəkdi.

Bu səbəblə, Allah rəsulu (sallallahu aleyhi və səlləm), oruc və namaz baxımından orta yolu seçmişdir. Bəzən oruc tutar, bəzən iftar edərdi.

Bununla bərabər, gecənin bir qismini ibadət, bir qismini də yuxu il keçirərdi.”

* * *

Səhl b. Sa’d (əs-Saidi) (رضى الله عنه)‘dan rəvayət edildiyinə görə, Peyğəmbər (ﷺ) belə buyurdu, demişdir:

Şübhəsiz, Cənnətdə Reyyan deyilən bir qapı vardır. Qiyamət günü:

‘Oruclular hardadır?’ deyə səslənilir.

Kim oruclulardan idi isə, o qapıdan girər və o qapıdan girən bir kimsə əbədi susuzluq hiss etməz.[1]

---------------

İzahı:

Tirmizi (رحمه الله) də bunu rəvayət etmişdir. Buxari və Muslim’də: ومن دخله لم يظمأ ابدا

Kim bu qapıdan girərsə, əsla susuzluq duymaz.  qismi xaric bunu rəvayət etmişlərdir.

Nəsai (رحمه الله)və ibn Xuzeymə (رحمه الله)‘nin rəvayətində isə, hədisin son qismi belədir:

ومن دخل شرب ومن شرب لو يظمأ ابدا

Kim bu qapıdan girərsə, içər və kim içərsə, əbədi susuzluq duymaz.

Reyyan kəliməsinin lüğət mənası, “sudan doymuş” deməkdir. Oruclulara təhsis edilən Cənnətin bir qapısına özəl isim verilmişdir. Bu isim, orucluların halına münasibdir.

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam: Orucun fəziləti haqqında gələn hədislər babı, hədis no: 1640

İmam Qurtubi (رحمه الله) bu haqda belə deyir:

Sudan doymuş mənasını ifadə edən Reyyan kəliməsinin Cənnətin qapısına isim olaraq verilməsi ilə kifayətlənilmiş, toxluğu ifadə edən bir isim verilməmişdir.

Çünki sudan doymaq, toxluğu gərəktirir və dolayısı ilə ona da dəlalət edər.

İbn Həcər əl-Əsqalani (رحمه الله) də öz görüşünü bu şəkildə açıqlayır:

Vəya orucluya susuzluq, aclıqdan daha çətin olduğu üçün sudan doymaq mənasını ifadə edən bir kəlimə seçilmişdir.

Buxari və Muslimin bir rəvayətində Cənnətin 8 qapısının var olduğu, bunlardan birinin isminin Reyyan olduğu və bu qapıdan yalnız oruc kimsələrin girəcəyi bildirilmişdir.

İmam Əbul Həsən əs-Sindi əl-Hənəfi (رحمه الله)bu haqda belə deyir:

Hədisdəki oruclulardan məqsəd, çox oruc tutanlardır. Necə ki:

• ədaləti alışqanlıq halına gətirənə- adil;

• zülm etməyi alışqanlıq halına gətirənə də- zalım deyilir.

Bir dəfə ədalət edənə, adil; vəya bir dəfə zülm edənə zalım deyilməz.

Çox oruc tutan kimsə, fərz orucla bərabər, nafilə oruc da tutana deyilir. Yalnız Ramazan orucunu tutmaqla kifayətlənənə zahirən çox oruc tutandır deyilməz.

Hədisin:

"...əbədə qədər susuzluq duymaz..." cümləsinin zahirinə görə, susuzluq duymamaq vəsfi, Reyyan qapısından girənlərə məxsusdur.

Allah Taala'nın: لا تظمأ فيها "...sən burda susuzluq duymayacaqsan..." (Taha/119)

ayəti isə, Cənnəttə heç kimsənin susuzluq duymayacağına dəlalət edər. Bu halda, hədisin zahiri, ayətə tərs düşər.

Ancaq ayət belə izah edilə bilər:

Ayətdən məqsəd, Cənnətdə susuzluğun olmaması deyildir. Məqsəd, cənnət içkilərinin ara verilmədən ehsan edilməsidir. Artıq insan Cənnət'də susuz qalmaz.

Lakin ehsan edilən içkiləri istifadə etməsə belə, susuzluq hiss etməyəcəyi mənası qəsd edilməmişdir.

Hədisdə qəsd edilən məna isə, Reyyan qapısından Cənnət'ə girənlərdə susuzluq hiss etmə halının kökündən qaldırılmış olmasıdır. Yəni Cənnət'dəki içkiləri içməsələr belə, susuzluq hiss etməyəcəklərdir.

Belə də izah vermək mümkündür:

Hədisdən məqsəd, Reyyan qapısından Cənnətə girənlər, giriş anından etibarən susuzluq hiss etməyəcəklərdir.

Digər qapılardan girənlər isə, Cənnətdəki məqamlarına çatdıqları zaman, susuzluq hiss etməyəcəklərdir. Aradakı fərq budur.

* * *

Əbu Hureyrə (رضى الله عنه)‘dan rəvayət edildiyinə görə, Allah Rəsulu (ﷺ) belə buyurmuşdur:

Birinizin oruc tutduğu gün olduğu zaman, (qəti olaraq) çirkin söz söyləməsin. Və cəhalətin gərəklərindən bir şey işləməsin. Əgər bir kimsə, ona qarşı cahilcə davransa: -Mən oruclu bir adamam desin.[1]

---------------

İzahı:

Kütüb-ü sittə sahibləri (Buxari (رحمه الله), Muslim (رحمه الله), Tirmizi (رحمه الله), Əbu Davud (رحمه الله), Nəsai (رحمه الله)) və Malik (رحمه الله) və Beyhaqi (رحمه الله) də bu hədisi, bənzər ləfizlərlə rəvayət etmişlərdir. Bəzi rəvayətlər isə, bir az uzundur.

---------------

Hədisin: “cahilcə davranmasın” cümləsinin açıqlaması bəhsində, əl-Mənhəl əsərinin (əl-Mənhəlu’l-Azbi’l-Mevrud Şərhu Sünəni Əbî Davud) müəllifi- Mahmud Muhammd Xattab əs-Subqi (رحمه الله) belə deyir:

Yəni qiybət, boş söz, lağlağı etmək və s. günahlar kimi, cahillərin karı olan şeylərin heç birisini işləməsin. Məqsəd, bu hərəkətlərin yalnız oruc halında qadağan edildiyini, digər zamanlarda mübah olduğunu bildirmək

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam: Oruclunun qiybət və çirkin söz söyləməsi haqqında gələn hədislər babı, hədis no: 1691

deyildir. Məqsəd, oruc halında bu kimi hərəkətlərdən daha çox uzaq qalmaqdır.

Müəllif, hədisin: “Mən oruclu bir adamam, desin” cümləsinin açıqlaması bəhsində isə, belə deyir: Orucluнun bu sözü dili ilə mi söyləyəcəyi, yoxsa qəlbində mi söyləyəcəyi xüsusunda ixtilaf edilmişdir.

İmam Rafii (رحمه الله)nin nəqlinə görə, imamlar, bu sözü qəlbində söyləməsi izahını ixtiyar etmişlərdir. Çünki dillə söyləməkdə riyakarlıq və göstəriş ola bilər.

İmam Nəvəvi (رحمه الله), əl-Əzkar’da bu sözü dil ilə söyləmə izahını seçmiş, digər izahın da gözəl olduğunu bəyan etmiş və: Əgər həm dil ilə, həm də qəlb ilə söyləsə, bu da uyğundur. demişdir.

İmam Ruyani (رحمه الله)yə görə isə, əgər Ramazan ayı isə, dili ilə söyləsin, başqa bir oruc tutmuş isə, qəlbində söyləsin.

Oruclunun bu sözü söyləməsindəki hikmət, öz nəfsini pislikdən uzaq tutmaq və ya qarşısındakını bununla pis davranışdan yayındırmaqdır.

* * *

Oruc 3 dərəcəlidir:

1. Sıradan xalqın tutduğu oruclar;

2. Havass'ın (seçilmişlərin) orucları;

3. Havassu'l-Havas'ın (seçilmişlər içərisindəki seçilmişlərin) orucları

1. Xalqın tutduğu oruclar:

Mədəni yemə və içməkdən, cinsiyyət organlarını da cinsi münasibətdən uzaq tutmaqdır.

2. Seçilmişlərin tutduğu oruclar:

Yuxarıdakı maddi şərtlərə diqqət etməklə bərabər, qulaqları, gözləri, dili, əl-ayaq və digər orqanları da günahlardan qorumaqdır.

3. Seçilmişlər içərisindəki seçilmişlərin orucları:

Qəlbi bayağı düşüncələr və dünyaya yönəlmiş fikirlərdən uzaqlaşdırmaq surəti ilə Əziz və Cəlil olan Allah'tan başqa hər varlıqla qəlbin münasibətini kəsməkdir.

Belələrinin orucları, Allah Taala ilə axirət günü xaricindəki şeyləri zehinlərinə gətirdiklərində pozulacağı kimi, dini məqsəd daşımayan, dünyaya yönəlmiş düşüncələri ilə də orucları pozulur. Ancaq dini məqsədli düşüncələr, axirət azuqəsi sayılıb, dünyaya aid düşüncələr qəbul edilmədiyindən, bu cür düşüncələrlə, onların orucları pozulmaz.

"Qəlb qəhrəmanları" belə deyərlər:

"Oruclu kimsənin axşam nə ilə iftar edəcəyi dərdinə düşüb yemək hazırlığı etməsi, dəftərinə bir xəta olaraq qeyd edilər."

Çünki belə bir düşüncə, Allahın ehsanına güvənin azlığını, Onun ruzi mövzusunda verdiyi sözə qəti inancın zəyifliyini görsədir. Bu, peyğəmbərlər ilə siddiq və muqarreb (Allaha daha yaxın) kimsələrin rütbəsidir.

Belə bir oruc, Allahdan başqa hər varlıqdan sıyrılıb düşüncəni tamamilə Ona sərf etmək və Əziz və Cəlil Allah'ın:

"(Ya Rəsulum!) Sən: "Allah!" deyib çağır, sonra da onları burax ki, düşdükləri bataqlıqda oynaya-oynaya qalsınlar. (Özlərinin dedi-qodularında, pis işlərində və yaramaz əqidələrində davam etsinlər." (Ənam/91)

ayətində vurğulanan mənaya bürünməkdir.

2) Seçilmiş kimsələrin orucları və özəllikləri:

Seçilmişlərdən məqsəd, saleh, yaxşı hal sahibi kimsələrdir. Bunların orucları, organları günahlardan qorumaqdır. Bu da 6 şeyin yerinə gətirilməsi ilə gerçəkləşib tamamlanır:

1. Gözlərin orucu:

Gözləri məşğul edəcək, Allahı anmaqdan uzaq tutacaq pislənən və çirkin görülən hər hərkəttən uzaq tutmaq, görmə sahələrini azaldmaqdır. Peyğəmbər (ﷺ) belə buyurur:

‘Harama baxmaq, İblis’in oxlarından zəhərli bir oxdur. Allah qorxusu ilə, bu baxışdan vaz keçən kimsəyə, Əziz və Cəlil olan Allah, dadını hiss edəcəyi bir iman verər.’

2. Dilin orucu:

Dili, artıq-əskik sözlərdən, yalandan, qiybətdən, söz daşımaqdan, pis laqqırtılardan, kobud sözlərdən, söz güləşdirməkdən, mübahisələrdən qoruyub susmağa məcbur etmək, Allahı anmaqla məşğul etmək və Quran oxumağa yönəltməkdir. Dildəki bu əməliyyatlar, dilin orucudur.

Bişr b. əl-Haris (رحمه الله), Süfyan əs-Sevri’nin (رحمه الله):

‘Qiybət, orucu pozar.’ dediyini rəvayət etmişdir.

Leys bin Sad (رحمه الله)də, Mücahidin (رحمه الله) belə dediyini bildirir:

“2 şey orucu pozar: Qiybət və yalan.”

Peyğəmbər (ﷺ) belə buyurur:

“Oruc bir qalxandır. Biriniz oruclu ikən söyməsin, cahillik edib dalaşmasın. Birisi onunla döyüşməyə qalxsa vəya ona söyməyə başlasa, ‘Mən orucam, mən orucam.” desin.

Allah rəsulunun sağlığında belə bir hadisənin yaşandığı xəbər verilir:

Peyğəmbər (ﷺ) zamanında 2 qadın oruc tutmuş və günün son saatlarına doğru aclıq və susuzluqdan halsız

düşmüşlərdi, az qalsın, həlak olacaqlardı. Oruclarını pozmaq üçün Allah Rəsuluna (ﷺ) xəbər göndərib, izn istədilər. Allah Rəsulu (ﷺ) bir qədəh göndərdi və vəzifəli şəxsə:

-'Onlara de, yediklərini bu qədəhə qussunlar.' diyə tənbeh etdi.

Qadınlardan biri qusunca, ağzından təptəzə qan və ət parçası gəldi və qusduqları ilə qədəhin yarısı doldu. O birisi də, eyni şəkildə qusdu. Beləcə, qədəh doldu. Hər kəs bu haldan təəccübləndi. Bunun üzərinə Peyğəmbər (ﷺ):

'O 2 qadın, Allahın onlara halal qıldığı yeməklərdən uzaq durub oruc tutdular, amma Allahın, üzərlərinə haram qıldığı şeyləri yedilər. Bir arada oturub insanları çəkişdirdilər, qiybət etdilər. Bax bu qədəhdə görülənlər, qiybət etdikləri insanların ətləridir.' buyurdu.

3. Qulaqların orucu:

Qulaqları çirkin görülən şeyləri dinləməkdən qorumaqdır. Çünki söylənməsi haram olan hər sözün dinlənməsi də haramdır. Bundan ötürüdür ki, Allah (Azzə və Cəllə) pis sözlərə qulaq verənlə haram yeyənləri bir tutub Maidə surəsinin 42-ci ayətində belə buyurur:

"Onlar, yalana qulaq asanlar və haram yeyənlərdir.

Əgər yanına gəlsələr, aralarında hökm et və ya onlardan üz çevir. Əgər onlardan üz döndərsən, sənə heç bir zərər verə bilməzlər. Əgər aralarında hökm etsən, ədalətlə hökm et. Allah ədalət sahiblərini sevər!"

Yənə Allah (subhənəhu və taala) başqa bir ayətdə də belə belə buyurur:

“Kaş onların (yəhudilərin) din alimləri və fəqihləri, onlara günah söyləməyi və haram yeməyi qadağan edəydilər! Onların törətdiyi əməllər necə də pisdir!” (Maidə/63)

Elə isə, edilən qiybətə səs çıxarmamaq haramdır.

Bir ayətdə də Allah Taala belə buyurur:

“Allah Kitabda (Qur’anda) sizə nazil etmişdir (bildirmişdir) ki, Allahın ayələrini inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman müşriklər başqa bir söhbətə girişməyənə qədər onlarla bir yerdə əyləşməyin! Çünki o vaxt siz də onların tayı olarsınız. Həqiqətən, Allah münafiqlərin və kafirlərin hamısını Cəhənnəmdə bir yerdə toplayacaqdır!” (Nisa/140)

Bundan ötürü Allah Rəsulu (ﷺ) belə buyurmuşdur:

“Qiybət edənlə qiybətçinin qiybətini dinləyən, günahda ortaqdırlar.”

4.Digər orqanların orucu:

Əl və ayaq kimi digər orqanları günah və çirkin davranışlardan, mədəni də iftar vaxdında şübhəli yeyəcək və içəcəklərdən qorumaqdır.

Bəli, halal yeməkləri yeməyib oruc tutmaq və ardından haram yeyəcəklər ilə iftar açmanın mənası yoxdur. Belələri, bir köşk qurmaq üçün bir şəhəri yıxan kimsələri xatırladır. Çünki halal yeməklər, növləri etibarı ilə deyil, çoxluqları cəhətindən zərərlidirlər.

Orucla güdülən məqsəd, bu çox yeməyi azaldmaqdır.

‘Zərəri toxuna bilər’ qayğısı ilə çox dərman içməkdən qaçıb zəhər içməyə cəhd edən, axmaqdır.

Haram, dini yox edən bir zəhər ikən, halal da azı yararlı, çoxu zərərli bir dərman özəlliyindədir.

Orucun məqsədi, halallardan istifadəni ən minimum səviyyəyə endirməkdir. Peyğəmbər (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

‘Neçə oruc tutanlar vardır ki, oruclarından aclıq və susuzluqdan başqa faydaları yoxdur.’

Hədisin izahında belə kimsələrin:

oruclarını haramla açanlar olduğu söyləndiyi kimi;

özlərini haram yeməklərdən uzaq tutub haram qılınmış olan qiybətlə insanları çəkişdirmək surəti ilə onların ətləri ilə iftar açanlar olduğu da söylənmişdir.

5. İftarda az yemək:

Seçilmişlərə aid orucu tuta bilmək üçün iftar vaxdında halal yeyəcəklərdən də olsa, qarını necə gəldi doldurmamaqdır.

Gündüz yemədiyi şeyləri, axşam iftar vaxtında yeyən kimsə, Allahın düşmənini (şeytanı) məğlub etmək və şəhvətini qırmaq üçün tutduğu orucdan necə faydalana bilər?

Hətta zaman-zaman bəziləri, oruclu ikən yemədikləri yeməkləri, iftarda yeyirlər. Yenə bir neçə ayda yeyiləməyəcək qədər çox və fərqli yeməklər, Ramazan üçün toplanılıb bu ayda yeyilməsi adət-ənənəyə çevrilmişdir.

Halbuki oruc tutmaqla güdülən məqsəd, təqva mərtəbəsinə çatmaq üçün ac qalıb şəhvəti qırmaqdır.

Mədə sabahdan axşama qədər boş buraxıldığından axşam üstü bol və dadlı yeməklərin qarşısına keçdiyində istəyi qabarır, yeyib doyduqca yemə arzusu artır, gücü qat-qat çoxalır. Nəfsin şəhvət impulsları hərəkətə keçir. Halbuki normal yemək adətini davam etdirsə idi, böyük ehtimalla bütün bunlar başına gəlməyəcəkdi.

Orucun ruhu və özü, şeytanın -pisliklərə sürükləmək üçün vasitə olaraq istifadə etdiyi- güclərini zəyiflətməkdir. Bu da ancaq yeməyi azaldmaqla mümkün olur.

Yəni oruc olmadığında adət etdiyi yemək miqdarı nə qədərdirsə, oruc tutduğunda iftarını açarkən də eyni nisbətdə yeməlidir.

Günün digər hissələrində yediyi yeməkləri toplayıb axşam iftarda yesə, orucundan heç bir fayda görə bilməz.

Hətta aclığı hiss etməsi və bədəninin zəyiflədiyini duyması üçün gündüzləri çox yatmamaq da, orucun ədəblərindəndir.

Belə etdiyi təqdirdə, qəlbi təmizlənər, hər gecə bir az daha zəyiflədiyi üçün rahatca gecə namazlarına qalxmağa və virdlərini (davamlı olaraq etdiyi ibadətlərini, zikirlərini) etməyə fürsət tapar.

Belə bir hala sahib olan kimsənin qəlbi üzərində şeytanın dolaşa bilməyəcəyi və göylərin gizliliklərini seyr edə biləcəyi umular.

Qədir gecəsi də, mələkut aləminin (əşyanın iç üzü, həqiqətinin) sirlərindən bəzi sirlərin açıldığı bir gecədən ibarətdir. Allah Taala'nın:

'Biz, Quranı Qədir gecəsində endirdik.' (Qədir/1)

ayəti ilə də bu məna qəsd edilmişdir.

'Qəlbi ilə sinəsi arasına yemək torbası asan' kimsə, bu sirlərdən məhrum qalar. Bütün düşüncəsi ilə Allaha yönəlmədikcə mədəsini boş buraxması,Allah ilə aradakı pərdəni qaldırmağa yetməz.

Əsas məqsəd, bütün düşüncələri Allaha həsr etməkdir. Bunun ilk pilləsi də, yeməkləri azaldmaqdır.

6. Qəlbin qorxu ilə ümid arasında olması:

Qəlbi iftardan sonra qorxu ilə ümid arasında gedib-gəlməlidir. Orucları qəbul edilən muqarreb (Allaha daha yaxın) insanlardan mı, yoxsa orucları üzlərinə vurulan bədbəxtlərdənmi olduğunu bilmədiyindən narahatçılıq içərisində olmalıdır. Əslində tək orucda yox, hər ibadətin sonunda belə bir duyğu hiss edilməli, zehin bu narahatlığı duymalıdır.

Həsən b. Əbu'l-Həsən b. əl-Həsən əl-Basri (رحمه الله) bir Ramazan günü, gülüb əylənməkdəki bir topluluğun yanından keçərkən bunları söylədi:

"Allah Ramazan ayını qulları üçün bir yarış meydanı olaraq yaratmışdır. Xalq bu ayda ona ibadət üçün yarışarlar.

Bir grub irəli keçib yarışı qazanır, digərləri geri qalıb yarışı uduzurlar. Yarışı qazananların qurtulduğu; ya-

rışa qatılmayanların isə, peşman olduğu hala düşdüyü bir gündə, gülüb əylənən bir oyunçuya həqiqətən də gülünər!

And olsun Allaha, aradaki pərdə qalxıb gerçəklər görülsə, yaxşılıq edənin sevinci özünü oyun oynamaqdan, doğru yolda olmayanın gülüşü də özünü gülməkdən uzaq tutar, ona bu gülüş qapısını bağladırdı.

Ahnef b. Qays’a (رحمه الله):

-’Sən bir xeyli yaşlısan, oruc səni zəyif buraxmaqdadır, oruc tutmasan, olmaz mı?’ deyə soruşulduğunda, belə cavab vermişdi:

-’Mən uzun bir yolçuluq üçün hazırlıq edirəm. Allaha itaət uğrunda səbr göstərmək, əzabına səbr göstərməkdən çox daha asandır.’

Bax, orucda diqqət edilməsi gərəkən mənəvi incəliklər bunlardır.

Fəqihlərin verdikləri fətvaların izahı:

Sual:

Oruc tutan, oruclu olduğu müddət içində yeməkdən, içməkdən və cinsi münasibətdən uzaq durub sənin yuxarıda işarət etdiyin [1] incəliklərin (6 şərtin) heç birisinə diqqət etməsə, fəqihlərə görə orucu səhih sayılır.

Bunu necə izah edəcəksən?

Cavab:

Maddi şərtləri dəyərləndirən fəqihlərin hökmlərini verərkən irəli sürdükləri dəlilləri, bizim mənəvi

şərtlərdə -xüsusi ilə də qiybət və bənzəri daxili xəstəliklər mövzusunda- gətirdiyimiz dəlillərdən çox zəyifdir.

Ancaq fəqihlər dünyaya sarılmış, qəflətə dalmış xalq yığınlarının asanca altından qalxa biləcəkləri mükəlləfiyətləri onlara çatdırmaqla vəzifəlidirlər.

Axirət alimləri isə, orucun səhih olmasından- qəbulunu; qəbul edilməsindən də- hədəfə çatmağı güdürlər.

Hədəfə çatma məfhumu ilə də Allahın Saməd, yəni kimsəyə möhtac olmama, Onun əxlaqı ilə əxlaqlanmağı, imkanları nisbətində şəhvətlərdən uzaqlaşıb mələklərə bənzəməyi qəsd edirlər. Çünki mələklər şəhvətlə xəstə olmayan varlıqlardır.

Ağıl nuru ilə şəhvətlərini təsirsiz qılma gücünə sahib bir insanın rütbəsi, heyvanlardan üstün olmaqla bərabər; şəhvətlərin əsiri olub şəhəvi istəkləri ilə savaşma məcburiyətində buraxılmış insanın dərəcəsi də mələklərin dərəcəsindən aşağıdır. İnsan, şəhvətləri arxasından getdikcə, ən aşağı təbəqələrə yuvarlanar və heyvanlardan da aşağı bir dərəcəyə düşər.

Tam əksinə, şəhvətlərlə mücadilə edib onları söküb atdıqca, ucaların ən üstün dərəcələrinə (ala-yı illiyyinə) yüksələr, mələklərin üfqünə varar. Mələklər isə, Əziz və Cəlil Allaha yaxınlıq peyda etmiş varlıqlardır. Onlara tabe olan və onlara bənzəməyə çalışan, heç şübhəsiz onların yaxınlığı kimi, Əziz və Cəlil Allaha yaxınlaşar. Təbii ki, bu yaxınlıq məkan yaxınlığı deyil, mənəvi yaxınlıqdır.

‘Ağıl və qəlb qəhrəmanları’, orucun sirrini bu

şəkildə anladıqlarına görə, gündüz vaxdı digər arzuları arxasında qaçmaqla birlikdə, bir ovuc yeməyini gecikdirib axşam iftar vaxdında iki qat yemək yeyən üçün, oruc nə kimi faydalar təmin edə bilər?

Bu hərəkətlər fayda versəydi, onda Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in:

'Neçə oruc tutanlar vardır ki, oruclarından aclıq və susuzluqdan başqa faydaları yoxdur.'

sözlərinin nə mənası ola bilər?

Bundan dolayıdır ki, Əbu'd-Dərda (رضى الله عنه) belə demişdir:

'Ağıllı adamların yuxuları da, iftarları da nə gözəldir! Ağıllılar necə olur ki, axmaqların oruclarını və yuxusuz qalmaqlarını ayıblamırlar?!

Yəqin və təqva sahibi birinin zərrəcə ibadəti, özünü aldadan axmaqların dağlar kimi ibadətlərindən üstündür.'

Yenə bundan ötürüdür ki, alimlərdən biri belə demişdir:

'Neçə oruclu kimsələr vardır ki, əslində orucsuzdur; neçə oruca niyyət etməmiş kimsələr də vardır ki, gerçəkdə orucdurlar.'

Əslində oruclu sayılan, amma oruca niyyət etməmiş kimsə, yeyib-içdiyi halda, orqanlarını günahdan qoruyan kimsədir.

Oruca niyyət etdiyi halda, əslində orucsuz sayılan da, ac və susuz durub, amma orqanlarını günahlar üçün buraxandır.

Orucun incəliyini anlayan kimsə,

yemək, içmək və cinsi münasibətdən qaçdığı halda günahlardan uzaq durmayan kimsənin, dəstəmaz alarkən su tökmədən qolunu üç dəfə məsh edən kimsəni xatırlatdığını bilər.

Bəli, bu kimsə dəstəmaz alarkən qollarını üç dəfə məsh etmək surəti ilə görünüşdə sayıya diqqət etmiş, ancaq ən önəmli olan yuma əməliyyatını yerinə gətirməmişdir.

Sözüm odur ki, belə bir dəstəmazla qılınan namaz, o kimsənin üzünə çırpılar.

Orucunu yeyən, amma günahlardan uzaq duran kimsənin vəziyyəti:

Oruc tutmadığı halda, orqanlarını günahlardan və pisliklərdən qoruyan kimsə, dəstəmaz üzvlərini məsh etmədən bir dəfə yuyan kimsə kimidir. Bu kimsə, dəstəmazın əslini yerinə gətirdiyi üçün, fəziləti tərk etmiş olsa da, in şə Allah namazı səhihdir.

Yemə və içmədən özünü uzaq tutduğu kimi, orqanlarını da günahlardan uzaq tutan kimsə də, dəstəmaz orqanlarını 3 dəfə yumaq surəti ilə tam dəstəmaz alan kimsə kimidir ki, həm əsli, həm də fəziləti birlikdə etmişdir. Ən kamal mərtəbə də budur.

Peyğəmbər (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

'Şübhəsiz, Allah sizə, əmanətləri əhlinə verməyinizi əmr edər.' (Nisa/58) ayətini oxuduğunda, əlini qulağına və gözünə qoyub:

‘Qulaq bir əmanətdir, göz bir əmanətdir.’

buyurmuşdu.

Əgər qulaq və göz, bir əmanət olmasa idi, Peyğəmbər (ﷺ) sataşılmaq istənilən oruclunun:

‘Mən orucam, mən orucam.’ deməsini əmr buyurmazdı.

O kəs, bu cavabı ilə:

‘Dilim, qorumaq üçün mənə buraxılan əmanətdir, sənə cavab vermək üçün necə açıb buraxa bilərəm?’ demək istəyər.

Bütün bu açıqlamalardan hər ibadətin:

1) Zahir - maddi yönü;

2) Batin - mənəvi yönü;

3) Qabığı;

4) Özü

olduğu ortaya çıxmışdır.

Qabıqlarının da dərəcələri və hər dərəcənin də mərtəbələri vardır.

Artıq ixtiyar sənindir, istər qabıqla kifayətlən, istər özəyinə enərək ağıl və bəsirət sahibləri arasında yer al.

(Hüccətü’l-İslam imam Ğazzali, İhya’u-Ulumi’d-din, 1. Cild, 6. Kitab, 2. Bölmə: Orucun batini fərzləri, s. 556-560)

* * *

Salman b. Amir (رضى الله عنه)dan rəvayət edildiyinə görə, Rəsulullah (ﷺ) belə buyurdu:

Biriniz iftarını açacağı zaman, xurma ilə açsın. Əgər (xurma) tapmazsa, su ilə iftar etsin. Çünki, su, təmizləyicidir.(1)

---------------

İzahı:

Əhməd (رحمه الله), Tirmizi (رحمه الله), Əbu Davud (رحمه الله), Darimi (رحمه الله) və Hakim (رحمه الله)də bunu rəvayət etmişlərdir.

Hədisdəki əmr, məndubluq üçündür, vaciblik üçün deyildir.

Əl-Mənhəl əsərinin müəllifi, xurma ilə iftar açmağın hikməti haqqında belə deyir:

Çünki xurma şirindir. Oruc tutma ilə zəyiflənən gözlər, şirniyyat yeməklə qüvvət qazanır.

Xurma yemək, iman şirinliyinə və günah acılığının ortadan qaldırılmasına da işarəttir. Çünki oruc, ibadətlərin ən böyüklərindəndir və ibadətlər pislikləri ortadan qaldırar.

İbn-i Həcər əl-Məkki (رحمه الله), bu haqda belə deyir:

Xurmanın özəlliklərindən biri budur:

---

1 İbn Macə, Sünən Tərcümə və Şərhi, Kitabu's-Siyam: iftarı nə ilə açmağın müstəhəb olduğuna dair gələn hədislər babı, hədis no: 1699) üçün deyildir.

1. Xurma, mədəyə çatdığı zaman, onu boş taparsa, qida vəzifəsini yerinə yetirər.

2. Mədədə yemək artığını taparsa, onu bağırsaqlara sürükləyər.”

3. Təbiblər, xurmanın gözü zəyiflətdiyini söyləmişlərsə də, onların sözü, çox xurma yeməyə aiddir.

4. Xurma tapılmadığı təqdirdə, su ilə iftar edilməsi əmr edilərək, suyun çox təmizləyici olduğu bildirilmişdir.

5. Su, susuzluğu ortadan qaldırır, vücudun maddi və mənəvi yönlərdən təmizlənməsi izahına vəsilə olur.

* * *

Ənəs b. Malik (رضى الله عنه)‘dan rəvayət edildiyinə görə, Allah Rəsulu (ﷺ) belə buyurmuşdur:

Səhər vaxtında yeyin və için. Çünki onda bərəkət vardır.[1]

---------------

İzahı:

Buxari (رحمه الله), Muslim (رحمه الله)və Tirmizi (رحمه الله)də bu hədisi rəvayət etmişlərdir. Tirmizi (رحمه الله), hədisin həsən-səhih olduğunu söyləmişdir.

İbn Hacər əl Əsqalani (رحمه الله), Fəthu’l-Bari’də belə deyir:

Bəzilərinə görə, “bərəkət”dən məqsəd:

“Səhər vaxtında sahur yeməyi vəsiləsi ilə oyanıb dua etməkdir. Ən uyğunu isə, budur ki:

Sahur yeməyinə qalxmaqla fərqli yönlərdən bərəkət hasil olur. Bu yönlərin bir qismi bunlardır:

•Peyğəmbər (ﷺ) in sünnətlərinə riayət etmək;

• Kitab əhlinə müxalifət etmək;

• İbadət üçün qüvvət almaq;

• Aclığın yol açdığı halsızlığı bərpa etmək;

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): Sahur yeməyini yemək haqqında gələn hədislər babı, hədis no: 1692

• Gümrahlıqla oruc ibadətinə yönəlmək;

• Səhər vaxtında kömək istəyən yoxsullara sədəqə vermək;

• İbadət və duaların məqbul olduğu qüvvətlə umulan səhər vaxtında ibadət və dua etmək;

• Oruc niyyətini axşam unutmuş olana, niyyət etmə imkanını qazandırmaqdır."

Hədisdəki əmr, alimlərcə məndubluq üçündür. Yəni oruc tutacaq kimsələrin səhər vaxtında qalxıb bir şey yeməkləri və yə içməkləri, sünnətdir, vacib deyildir.

İbnu'l-Munzir (رحمه الله), bu hüküm xüsusunda icma olduğunu söyləmişdir.

* * *

Səhl b. Sad (رضى الله عنه)‘dan rəvayət edildiyinə görə, Rəsulallah (ﷺ) belə buyurmuşdur:

İnsanlar iftar etməkdə tələsdikləri müddətcə daim xeyir ilə yaşayarlar.

---------------

Əbu Hureyrə (رضى الله عنه) ’dan rəvayət edildiyinə görə, Rəsulullah (ﷺ) belə buyurmuşdur:

İnsanlar iftar etməkdə tələsdikləri müddətcə xeyir ilə yaşayarlar. İftar etməkdə tələsin. Çünki yəhudilər, (iftarlarını) geciktirərlər.

Not: Məcməu’z-Zəvəid’də belə deyilmişdir: Bunun isnadı Buxari və Muslim’in şərti üzərinə səhihdir. Bu hədisi İmam Buxari (رحمه الله), İmam Muslim (رحمه الله) və başqaları Səhl b. Sa’d’ın rəvayətilə zikr etmişlərdir.

İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): İftar açmaqda tələsmək haqqında gələn hədislər babı, hədis no: 1697-1698

---------------

İzahı:

Səhl’in hədisini, İmam Buxari (رحمه الله), İmam Muslim (رحمه الله) və Tirmizi (رحمه الله)də rəvayət etmişlərdir.

Əbu Hureyrə hədisini, Hakim (رحمه الله)də rəvayət etmişdir. Əbu Davud (رحمه الله) ilə İmam Nəsai (رحمه الله) də Əbu Hureyrə ‘ın hədisini mərfu olaraq (sənədi qüv-

vətli olsun və ya olmasın, Peyğəmbərə (ﷺ) isnad edilən hədis):

لا يزال الدين ظاهرا ما عجل الناس الفطر لأن اليهود والنصارى يؤخرون

İnsanlar iftar etməkdə tələsdikləri müddətcə, İslam qələbə çalmaqda davam edəcəkdir. Çünki yəhudilər və xristiyanlar, iftarlarını geciktirərlər; - mətnilə rəvayət etmişlərdir.

Hədislər, iftarı gecikdirmədən açmağın müstəhəbliyinə dəlalət edirlər. Təbii ki, günəşin batması şərti vardır.

İmam Şafei (رضى الله عنه) əl-Umm'da belə deyir:

"İftar açmaqda tələsmək müstəhəbdir. Geciktirilməsində fəzilət olduğu zənnilə qəsdən gecikdirmək, məkruhdur. Belə bir məqsəd olmadan gecikdirilməsində kərahət yoxdur."

İkinci hədis, yəhudilərin və xristiyanların iftarı gecikdirdiklərinə dəlalət edir. İbn Hibban (رحمه الله) və Hakim (رحمه الله)'in rəvayət etdikləri Səhl hədisindən Kitab əhlinin ulduzlar görülüncəyə qədər bu şəkildə iftarı gecikdirdikləri anlaşılır. Günümüzdə bəzi şəxslər də bu şəkildə iftarı geciktirirlər. Hədislər, bu davranışı rədd edərlər.

Müsəlmanların iftar açmaqda tələsdikləri müddətcə xeyir ilə yaşamağa davam edəcəkləri və İslam'ın digər dinlərə qələbə çalmağı davam etdirməyi məsələsinə gəlincə:

Əl-Mənhəl əsərinin (Əl-Mənhəlu'l-Azbi'l-Məvrud Şərh-u Sunən-i Əbu Davud) müəllifi İmam Mahmud Muhamməd Xattab əs-Subqi bu xüsusda belə deyir:

Yəni müsəlmanlar, Peyğəmbər (ﷺ) 'in sünnətinə bağlı qalaraq və İslamın gətirmiş olduğu sabit qanunları öz başlarına görə dəyişdirməyib olduğu kimi qoruduqları müddətcə, xeyir ilə yaşayarlar və düşmənlərini məğlub edərlər.

İslam prinsiplərinə zidd hərəkət etdikləri vaxd, bunların bu muxalifəti, şər içinə düşəcəklərinə əlamət olar.

Instagramdan izləmək üçün linkə daxil ola bilərsiniz.

https://www.instagram.com/p/B_-BiFGhcaP/?igshid=fn2jm4smgrh3

* * *

Əbu Zərr əl-Qifari (رضى الله عنه) dən belə rəvayət edilir:

Biz Allah Rəsulu   ilə bərabər bir Ramazan (ayı boyunca) oruc tutduq. (Ramazan ayından) 7 gecə qalıncaya qədər heç bir gecəsində bizə təravih qıldırmadı (vəya) gecəni ihya ettirmədi.

(Ay sonundan başına doğru) 7 gecə olunca, təxminən gecənin 1/3-i keçincəyə qədər bizə təravih qıldırdı. (Vəya gecənin o qismini ihya etdirdi).

Sonra o gecəni izləyən (axırdan) altıncı gecə oldu. (Amma) onda təravih qıldırmadı.

Nəhayət, (sondan) beşinci gecə oldu. (Ondan) təxminən gecənin yarısı keçincəyə qədər bizə təravih qıldırdı.

Mən:

Ey Allahın elçisi! Bu gecəmizin qalan qismini də ihya etməyimizi buyurmağınızı arzu edirik.' dedim. Buyurdu ki:

Şübhəsiz, imam namazdan dönüncəyə qədər onunla bərabər (işanın fərzini və) təravihi qılan kimsənin bu ibadəti, bir gecəni bütünü ilə ihya etməyə bərabər olur.

Sonra o gecəni izləyən (sondan) dördüncü gecə oldu, təravih qıldırmadı. Nəhayət, onu izləyən (sondan) üçüncü gecə oldu. O, zövcələrini və yaxınlarını topladı. Camaat da toplandı.

Əbu Zərr (رضى الله عنه) deyir ki, Peyğəmbər (ﷺ) o gecə, bizə qıldırdığı təravihi o qədər uzatdı ki, biz sahur

yeməyini qaçıracağımızdan qorxduq.

Deyildi ki: ‘Fəlah nədir?’

Əbu Zərr (رضى الله عنه): Fəlah, sahur yeməyini yeməkdir:-deyə cavab verdi.

Əbu Zərr (رضى الله عنه) deyir ki: O gecədən sonra, Peyğəmbərimiz (ﷺ), Ramazan ayının qalan 2 gecəsində bizə təravih namazından heç bir şey qıldırmadı.[1]

---------------

Tirmizi (رحمه الله), Əbu Davud (رحمه الله), Nəsai (رحمه الله), Tahavi (رحمه الله), Hakim (رحمه الله) və Beyhaqi (رحمه الله) də bunu rəvayət etmişlərdir. Tirmizi (رحمه الله) və Hakim (رحمه الله) bunun səhih olduğunu da qeyd edirlər.

Ərəblər günləri hesablarkən ay sonunu əsas alırlar. Onun üçündür ki, Əbu Zərr (رحمه الله) Ramazan ayının son 7 gecəsinin ilkinə yeddinci, ikincisinə altıncı, üçüncüsünə beşinci... demişdir.

Ərəbi aylar bəzən 29, bəzən 30 gün olduğu bilinməktədir. 28 vəya 31 olması ehtimalı yoxdur. Çünki ərəbi aylar, ayın yenilənməsi əsasına bağlıdır. Belə olduğu halda, hər ayın 29 günü doldurması qətidir. Otuzuncu gün şübhəlidir. Şübhəli günü hesaba qatmamaq gərəkdiyi üçün Əbu Zərr (رحمه الله) in dediyi

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu iqamətu’s-Sala: Ramazan ayı qıyamı (təravihlə ihyası) haqqınd gələn hədislər babı, hədis no: 1327

• yeddinci gecə- Ramazan ayının 23-cü gecəsi,

• altıncı gecə-Ramazanın 24-cü gecəsi,

• beşinci gecə-Ramazanın 25-ci gecəsi,

• üçüncü gecə- Ramazanın 27-ci gecəsi və

• qalan gecələr Ramazanın 28 və 29-gecələri olmuş olur.

Hal belə olduğunda, bu hədis, Peyğəmbərin (ﷺ) Ramazan ayının yalnız 23, 25 və 27-ci gecələrində təravih namazını qıldırdığına və ya bu gecələri camaatla ihya etdirdiyinə, ibadəti Ramazanın 23-cü gecəsi, gecənin 1/3-inə, 25-ci gecənin yarısına və 27-ci gecəsi şəfəqə yaxın bir zamana qədər uzatdığına dəlalət edər.

Ramazanın 27-ci gecəsi Peyğəmbər (ﷺ) hörmətli zövcələrini və yaxınlarını da təravih namazı üçün toplamışdır. Böyük bir camaata təravih qıldırmışdır.

Əbu Zərr (رضى الله عنه) 25-ci gecənin tamamını ihya etmək arzusunu Peyğəmbər (ﷺ) ə ərz etmiş, Peyğəmbərimiz də işa və təravih namazlarını imamla bərabər qılan bir kimsənin savabının o gecənin bütününü ihya edənin savabına bərabər olduğunu müjdələmişdir.

Hədisin: "من قام مع الإمام حتى ينصرف"

cümləsinin mənası budur.

Yalnız işa namazını imamla bərabər qılanın savabı isə, yarım gecənin ihyasına bərabər olur. Çünki Muslim (رحمه الله), Malik (رحمه الله), Tirmizi (رحمه الله) və

Əbu Davud (رحمه الله)-un Osman b. Affan (رضى الله عنه) dan rəvayət etdikləri bir hədisdə, Peyğəmbər (ﷺ) elə buyurmuşdur:

“من صلى العشاء مع الجماعة كام كقيام نصف ليلة ومن صلى العشاء والفجر فى جماعة كان كقيام ليلة“

“Kim işa namazını camaatla qılsa, gecənin yarısını ibadətlə ihya etmiş kimi olur.

Kim işa və sabah namazlarını camaatla qılsa, bir gecəni ibadətlə ihya etmiş kimi olur.”

---------------

Fəlah: Qurtuluş, xoşbəxtlik, zəfərə qovuşmaq, davamlı qalmaq və sahur yeməyini yemək kimi fərqli mənalara gəlir. Burda son mənanın qəsd edildiyi, Əbu Zərr (رضى الله عنه) tərəfindən ifadə edilmişdir.

Suhur: Sahur yeməyini yeməkdir.

Sahur: Sahur vaxdında yeyilən yeməklər və içilən içəcəklərdir.

---------------

Əl-Mənhəl əsərinin müəllifi belə deyir:

“Təravih namazının məsciddə camaatla qılınmasının evdə qılınmasından daha fəzilətli olduğuna hökm edən cumhur, bu hədisi dəlil göstərmişlərdir. Bu hədis, Nəsai (رحمه الله) və Taberani (رحمه الله)nin Zeyd b. Sabit (رضى الله عنه) dan rəvayət etdikləri:

“أفضل الصلاة صلاة المرء فى بيته إلا المكتوبة”

Fərz namaz xaric, ən fəzilətli namaz, adamın öz evində qıldığı namazdır.

hədisinin hökmünü xüsusiləşdirmişdir. Yəni təravih namazı da fərz namaz kimi bu hədisdən istisna edilmişdir.

Hədis, Peyğəmbər (ﷺ) in təravih namazını müəyyən aralarla 3 gecə qıldırdığını ifadə edər.

Cumhurun bir dəlili də, Ömər (رضى الله عنه) ın digər səhabələrin və onlardan sonra gələnlərin təravih namazını məscidlərdə və camaatla qılmalarıdır.

Malik (رحمه الله), Əbu Yusuf (رحمه الله), Şafiilər’in bir qismi və digər bəzi alimlər Zeyd (radiyallahu anh)’ın yuxarıdakı hədisini dəlil göstərərək, təravih namazını evdə tək başına qılmanın daha fəzilətli olduğuna hökm etmişlərdir.

Tahavi (رحمه الله), bu qövlü: ibn-i Ömər, İbrahim ən-Nəxai (رحمه الله), İshaq b. Suveyd (رحمه الله), Urvə (رحمه الله), Said b. Cubeyr (رحمه الله), Qasım (رحمه الله), Səlim (رحمه الله), Nafi (رحمه الله) və başqalarından nəql edərək, belə deyir:

Bu şəxslərin hamısı, Ramazan ayında evdə qılmağı, imamla qılmaqdan daha uyğun görmüşlərdir. Doğrusu da, budur.

Cumhur isə, yuxarıda toxunduğumuz kimi, Zeyd (رضى الله عنه)ın hədisini bayram namazı kimi camaatla

qılınması məşru qılınan sünnətlərdən başqa, nafilələrə təhsis etmişdir (xas qılmışdır). Çünki Peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) təravih namazımı Məscid-də camaatla qıldığı sabitdir.

---------------

Təravih namazı neçə rükətdir?

Təravih namazının rükət sayısı xüsusunda alimlər arasında ixtilaf vardır. Əl-Mənhəl əsərinin müəllifi bu ixtilafı və hər grupun dəlillərini zikr etmişdir.

Hənəfi, Şafii, Hənbəli alimləri; Malik (رحمه الله) və Davud (رحمه الله)un məşhur qövlünə; və bir çox alimə görə, onlar təravih namazının 20 rükət olduğuna hökm etmişlərdir.

Hər 2 rükətin sonunda salam verilməli və hər 4 rükətdən sonra qısa bir istirahət üçün oturulmalıdır. Bu istirahətlər səbəbi ilə, bu namaza təravih ismi verilmişdir.

Çünki təravih kəliməsi, ‘tərviha’nın cəm halıdır. Tərviha isə: rahatlamaq deməkdir. Çünki bunun arxasında istirahət üçün bir az oturulur.

Bu grupun dəlillərindən biri, Beyhaqi (رحمه الله)nin səhih bir isnadla əs-Saib b. Yezid (رضى الله عنه)dan rəvayət etdiği bu xəbərdir:

“Səhabələr, Hz.Ömər (رضى الله عنه), Hz.Osman (رضى الله عنه) və Hz.Əli (رضى الله عنه) dövrlərində, təravih namazını 20 rükət olaraq qılarlardı.”

İmam Tirmizi (رحمه الله) belə deyir:

“Alimlərin əksərisi, təravih namazının 20 rükət olduğuna dair Hz Ömər (رضى الله عنه), Hz.Əli (رضى الله عنه) və başqa səhabələrdən rəavətlər üzərində qərar qılmışlardır.”

Təravih namazının 8, 10, 16, 24, 34, 36 və 40 rükət olduğuna dair görüşlər də vardır.

İbni Abdi’l-Bərr (رحمه الله) belə izah gətirir:

“Peyğəmbər (sallallahu aleyhi və səlləm)’dən təravih namazının rükət sayısı haqqında bir hüdud varid olmamışdır.

• Peyğəmbər (ﷺ), Əbu Bəkr (رضى الله عنه) zamanında və Ömər (رضى الله عنه)in xilafət dövrünün ilk zamanlarında 8 və 10 rükət qılındığına dair rəvayətlə əməl etmək fəzilətlidir.

• Bundan sonra fəzilətli olanı- Ömər (رضى الله عنه), Osman (رضى الله عنه) və Əli (رضى الله عنه)nin zamanlarında tətbiq edilən 20 rükət olaraq qılmaqdır. Çünki Peyğəmbər (ﷺ) Rəşidi xəlifələrin sünnətinə möhkəm sarılmağı əmr etmişdir.”

Təravih namazı digər namazlardan fərqsiz olduğu üçün namazın sünnətlərini və ədəbini zədələyici bir sürətlə qılınmamalıdır.

* * *

Cabir b. Abdullah (رضى الله عنه) ‘dan rəvayət edildiyinə görə, o, belə demişdir:

Allah Rəsulu (ﷺ) xütbə oxuduğu zaman, səsi yüksələr və qəzəbi şiddətlənərdi. Sanki, o, düşmən ordusunu izləyən:

Şübhəsiz, düşmən sizə sabah basqın edəcək, axşam hücuma keçəcəkdir.’ deyən gözətçi biri idi.

(Təhlükəyə qarşı xalqa xəbərdarlıq edər) və:

‘Qiyamət günü ilə mən, bunlar kimi göndərildim.’ deyərdi.

Belə deyərkən də, şəhadət barmağı ilə onun yanındakı orta barmağını birləşdirərdi. Sonra deyərdi ki:

Söylənilən sözlərin ən xeyirlisi, Allah Taala’nın kitabıdır.Yolların ən gözəli, Muhamməd’in yoludur.İşlərin ən pislərindən biri də,(Peyğəmbərdən sonra) ihdas edilən (dinə əlavə edilmək istənilən) əsli olmayan şeylərdir.Bidət (lərin çoxu), dəlalətdir.[1]

---------------

İzahı:

Bidət: Keçmişdə nümunəsi olmadan edilən hər şeyə deyilir.

Şəriətdə isə, Allah Rəsulu (ﷺ) zamanında olmayan bir şeyi ihdas etməkdir (icad etməkdir, meydana çıxardmaqdır).

1 İbn Macə, Sünən tərcümə və şərhi, Müqəddimə: Bidətlərdən və mücadilədən uzaq qalmanın bəyanı babı, hədis no: 45

İmam Şafei (رضى الله عنه) demişdir ki, dini sahədə ihdas edilən şeylər 2 qisimdir:

1) Əgər Kitab, Sünnət və İcma'dan birisinə tərs düşərsə, zəmm edilən bidət (pis, pislənən bidət)'dir.

2) Bunlara zidd olmayan bir xeyirli işdirsə, o, məmduh bidət (gözəl və mədhə layiq bidət)'dir. (Kastalani, İrşadu's-Sari, c. 12, s. 227, Misir, h. 1306)

İmam Nəvəvi (رحمه الله) belə deyir:

Hədis mətnində keçən:

'Hər bidət, dəlalətdir.' cümləsi, ümumi görülməklə bərabər, qəsd edilən məna ümumi deyildir. Bu cümlə:

'Bidətlərin çoxu dəlalətdir.' mənasındadır. Buna bənzər hədislər də eyni şəkildə izah edilir.

Hz.Ömər (رضى الله عنه)'ın təravih namazı haqqında:

'Təravih, gözəl bidətdir.' sözü də, bu izahı dəstəkləyər.

Cümlənin başında istifadə edilən və ümumilik ifadə edən "kullun" (hər) kəliməsi, bu izaha mane deyildir. Çünki eyni kəlimənin istifadə edildiyi bəzi ayət və hədislər də təhsisli (bəzi şeylərə xas qılınmaqla) istifadə edilmişdir. Misal olaraq, Əhqaf surəsinin 25-ci ayəsində keçən:

"تُدَمِّرُ كُلَّ شَىْءٍ بِاَمْرِ رَبِّهَا"

"O əzab küləyi, hər şeyi -yəni bir çox şeyi- həlak edər."

cümləsində keçən "kullun" (hər) kəliməsi bu şəkildə

izah edilir. Çünki Hud əleyhissəlam və möminlər, o küləkdən zərər görməmişdilər.

Bununla bərabər İmam Nəvəvi (رحمه الله) belə deyir:

Alimlər demişlərdir ki, bidət bu 5 yerə bölünür:

1. Misal olaraq, dinsizlərə və bunlara bənzər qruplara qarşı kəlam əhlinin dəlilləri tənzim etmələri, vacib olan bidətlərdəndir.

2. Elmi kitabları təsnif etmək, mədrəsələr (məktəblər), kasıblar üçün yerlər və bənzəri müəssisələr açmaq, məndub olan bidətlərdəndir.

3. Məkruh və haram olan bidətlər, bəllidir.

"Təhzibu'l-Əsma və'l-Lüğat" adlı əsərimdə, bu mövzunu təfsilatlı və dəlilləri ilə bərabər zikr etmişəm.

---------------

"Təravih, gözəl bidətdir." sözü haqqında, İmam Azam Əbu Hənifə (رضى الله عنه)'yə sual verildiyində, o, belə deyir:

Təravih namazı, heç şübhəsiz, müəkkəd sünnətdir. Hz. Ömər (رضى الله عنه), bu namazın camaatla və 20 rükət qılınmasını, öz şəxsi içtihadı ilə etmədiyi kimi, bir bidət olaraq da əmr etməmişdir. O, özünün bildiyi şər'i bir əsasa və Hz Muhamməddin (ﷺ) bir vəsiyyətinə dayanaraq belə etmişdir. (Tahtavi, Haşiye, s. 334)

* * *

Sual:

Rəsulullah (ﷺ), 4 rəşidi xəlifənin yoluna tabe olmağı əmr etdiyinə görə, bəs digər səhabələrin fərqli görüşlərinə baxmayaraq, yalnızca bu 4 xəlifənin bir mövzuda görüş birliyi üzərində olmaları, bağlayıcı dəlillərdən olan (icma)'dan sayılır mı?

Cavab:

Bunların bir mövzuda söz birliyi etmələri, qəti olaraq dəlil sayılır. Amma hər kəsin tabe olması məcburi olan icmadan sayılıb-sayılmayacağı xüsusunda müsbət və mənfi olmaq üzərə 2 görüş irəli sürülmüşdür.

Sual:

4 xəlifədən birinin bir görüşü, digər hər hansı bir səhabənin görüşünə tərcih edilər mi?

Cavab:

İmam Əhmđəd (رضى الله عنه), Xattabi (رحمه الله) və bənzəri bəzi alimlərə görə, bir xəlifənin görüşü, digər hər hansı bir səhabənin görüşünə tərcih edilər. İkinci xəlifə olan Ömər b. Xattab (رضى الله عنه)üçün isə, bu tərcih əksəriyyətin görüşüdür. Çünki Rəsulullah (ﷺ) onun haqqında belə buyurmuşdur:

Allah Taala haqqı, Ömərin dilinə və qəlbinə yerləşdirmişdir.

Rəsulullah (ﷺ) bir hədisdə də belə buyurmuşdur:

Mən yuxuda özümü bir quyunun başında gördüm. Quyudan bir müddət su çəkdim. Sonra Əbu Bəkr gəldi. Özü də bir-iki vedrə su çəkdi. Sonra Ömər gəldi. Bir pəhləvan ədası ilə quyudan su çəkməyə başladı və çəkdikcə çəkdi. Mən Ömər kimisini görə bilmədim. Onun çəkdiyi sularla insanlar və heyvanlar doyunca su içdilər.

Ömər b. Əbdu'l-Əziz (رحمه الله) də Hz. Ömər'in hökmlərinə tabe olar və bunun üçün bu hədisləri dəlil olaraq zikr edərdi.

İmam Malik (رضى الله عنه), Ömər b. Əbdu'l-Əziz (رحمه الله)'in bu sözünü rəvayət etmişdir:

Rəsulullah (ﷺ) və onun rəşidi xəlifələri bəzi sünnətlər ortaya qoymuşlardır. Bu sünnətlərə tabe olmaq, Allah'ın kitabına tabe olmaqdır və Allah Taala'nın dinini yaşamaq üçün güc və qüvvət qazanmaqdır.

Bu sünnətləri dəyişdirmək, yerlərinə başqa şeylər qoymaq və onları tənqid mövzusu etmək, heç kimin haqqı deyildir.

Bu sünnətlərə tabe olanlar, hidayəti taparlar, onlardan faydalanmaya çalışanlar kömək görərlər. Sünnətləri tərk edənlər isə, möminlərin yolundan (möminlərin getmələri lazım olan doğru yoldan) saparlar."

İmam Malik (رضى الله عنه), bu sözü nəql etdikdən sonra, heyranlığını ifadə etmək üçün belə demişdir:

Ömər b. Əbdü'l-Əziz (رحمه الله) 'in, sünnətin dəyərini anlatmaqdakı isabəti və sünnətə tabe olmaq mövzusun-

dakı həssassiyəti, hər cür təqdirə layiqdir.”

Xələf b. Xəlifə (رحمه الله) bunları söyləyir:

Ömər b. Əbdü’l-Əziz (رحمه الله), xəlifə ikən söylədiyi bir xütbəyə şahid oldum. O, bu xütbəsində belə deyirdi:

Bunu bilin ki, Rəsulullah (ﷺ) ‘in və ilk 2 xəlifəsinin (Əbu Bəkr və Ömər’in) sünnət qıldıqları şeylər (hökmlər, əmrlər, fətvalar) dindir. Biz də bu şeyləri mənimsəyər və onların önündə durarıq (onları aşmarıq).

Azub əl-Kindi (رحمه الله)‘nin rəvayətinə görə, Rəsulullah (ﷺ) belə buyurmuşdur:

Məndən sonra ixtilaflar çıxacaqdır. Sizlər Ömər’in sünnətinə (tətbiqatına) tabe olmağa çalışın.

Hz.Əli (رضى الله عنه) (öz xilafəti vaxtında) Ömər’in hökm və qərarlarına tabe olar və:

Ömər, dində rəşid (haqqı bilən və bilərək ona tabe olan; kamilləşmiş; hidayətə çatmış) bir kimsə idi - deyərdi.

Şabi (رحمه الله)belə deyir:

İnsanlar bir mövzuda fikir ixtilafına düşüncə, siz, Ömər’in o mövzudakı fikir və hökmünə tabe olun. Çünki Ömər (radiyallahu anh), Rəsulullah (ﷺ) ‘in açıq bir sözü və hökmü olmayan məsələlərdə səhabələrlə istişarə edərdi. Bu səbəblə, onun hökm və görüşü həqiqətdə bütün səhabələrin hökm və görüşüdür.

Şabi (رحمه الله), bunu da deyir:

Önünüzə çıxan hər hansı bir mövzuda, ümmətin nəyin (hansı görüş və fikrin) üzərində icma etdiyinə baxın və belə bir icma varsa, ona tabe olun. Çünki Allah Taala, bu ümməti dəlalət və yalnış üzərində icma etdirməz.

Ümmət, icma deyil, ixtilaf etmişssə, o zaman da Ömər'in nə etdiyinə baxın və tətbiqatına (və söylədiyinə) tabe olun."

Mücahid (رحمه الله) belə demişdir:

Səhabələr bir mövzuda ixtilaf etmişlərsə, Ömər'in o mövzudakı görüşünə tabe olun.

İkrimə (رحمه الله)'yə belə bir sual verildi:

Azad bir kəsdən uşaq doğan cariyənin hökmü nədir?

İkrimə (رحمه الله) belə cavab verdi:

Uşağın atasının ölməsilə cariyə azadlığa qovuşar.

Ona belə dedilər:

Bunu harda çıxarırsan?

İkrimə (رحمه الله):

Qurandan!" diyə cavab verdi.

Ona:

Quran'ın hansı ayəsində belə deyilir? - dedilər.

İkrimə (رحمه الله):

Quran'da: Allaha, Rəsuluna və sizdən olan əmr sahiblərinə itaət edin.' buyurulmuşdur. (Nisa/59) Hz.Ömər

(رضى الله عنه) də, bu əmr sahiblərindəndir və bunu o söyləmişdir.” dedi.

Veki b. Cərrah (رحمه الله)belə deyir:

Ömər və Əli bir görüşdə birləşərlərsə, doğru olan o görüşdür.”

Abdullah b. Məsud (رضى الله عنه) and içərək belə demişdi:

Sırat-ı mustəqim,Ömər ‘in üzərində addımladığı yoldur.’

Sözün qısası, Hz.Ömər ‘in səhabələrlə birlikdə üzərində görüş birliyi və ittifaq etdikləri bir xüsus, qəti olan haqq və gerçəkdir. Bu icmadır və bütün müsəlmanları bu hökmə bağlayar.

Hz.Ömərlə digər səhabələr arasında görüş birliyi və ittifaqın hasil olmadığı bir xüsusda isə, öncəki kimi bağlayıcılıq yoxdur. Amma Ömər’in görüşü yenə tərcihə uyğundur.

## HƏR BİDƏT DƏLALƏTDİR. “

Dində uydurulan yeni şeylərdən (yeni fikirlərdən, yeni hökmlərdən, yeni tətbiqatlardan) çəkinin. Çünki bu növdən olan hər yeni şey, dəlalətdir.

Rəsulullah (ﷺ), bu sözü ilə, ümmətini özündən sonra meydana çıxacaq bidətlərdən və din sərhəddini aşan fikir, görüş, tətbiqatlardan çəkindirmiş və bu şeylərin dəlalət olduğunu bildirərək, onlara etibar edilməməsini istəmişdir.

Bidət deyilən və çəkinilməsi gərəkən bu şeylər, Şəriətdə mövcud bir əsl və qaydaya dayanmayan keyfi uydurmalardır.

Şəriətdə mövcud bir əsl və qaydaya dayanan yeni şeylər və yeniliklər isə, daha sonra meydana çıxmalarına/çıxarılmalarına baxmayaraq, bidət deyildirlər.

Quruluşu etibarı ilə sabit olan dinin, zaman içində dəyişən şərtlərlə ayaqlaşması və ortaya çıxan ehtiyaclara cavab verməsi, onun öz bağrından çıxan/çıxarılan yeni şeylər və yeniliklər sayəsində gerçəkləşir.

Onun öz bünövrəsində mövcud olmayan yeniliklər isə, onu pozarlar və onu din olmaqdan başqa bir şey halına gətirərlər. Bu səbəblə bidətlər, din üçün ən təhlükəli şeylər qəbul edilmişdirlər.

Cabir bin Abdullah (رضى الله عنه) ‘in rəvayətinə görə, Rəsulullah (ﷺ), Cümə günündəki bütün xütbələrində belə deyərdi:

Ən xeyirli söz, Allah Taala’nın sözüdür.

Ən xeyirli sünnət, Muhamməd’in sünnətidir.

Ən pis şeylər isə, dində uydurulan şeylərdir.

Bidət olan bu şeylər, dəlalətdirlər.

Kəsir b. Abdullah (رضى الله عنه) ‘ın rəvayətinə görə, Rəsulullah (ﷺ) belə buyurmuşdur:

“Kim, dində əsli olmayan bir bidət uydurarsa, özünə o bidətlə əməl edənlərin günahları qədər günah yazılar.”

Rəsulullah (ﷺ) ‘in: ‘Hər bidət, dəlalətdir.’ sözü, eynilə, daha öncə keçən:

Bir kimsə dinimizdə olmayan bir şey uydurarsa, uydurduğu şey rədd edilər - sözü kimidir.

Bu iki söz də, dində əsli olmadığı halda, din adına uydurulan hər şeyin rədd edilən bir bidət və dəlalət olduğunu ifadə edərlər.

Uydurulan bidətlər:

• etiqad;

• ibadət

və ya digər din işlərilə bağlı ola bilərlər.

Bütünü də pis olan bidətlərin ən pis olanları isə, etiqad ilə bağlı olanlarıdır. Çünki bunlar sahibini küfrə götürə bilərlər.

## BİDƏT OLMAYAN ŞEYLƏR:

Bidət kimi görünsə də, həqiqətdə bidət olmayan, bidət adlandırılsa belə, yalnızca ismi etibarı ilə belə olan yeniliklər də vardır.

•1• Bunlardan biri, təravih namazını camaatla qılmaqdır. Bu namazı camaatla qıldıran və onun bu şəkildə qılınmasının gözəl bir bidət olduğunu söyləyən, Hz. Ömər’dir.

Ancaq bu, durub dururkən uydurulmuş bir bidət deyildir. Çünki daha öncə  Rəsulullah (ﷺ), bir neçə gecə (3 gecə) bu namazı səhabələrilə birlikdə camaat halında

qılmış və lakin daha sonra onun bu şəkildə qılınmasının fərz qılınmasına yol aça biləcəyindən narahatçılıq duyaraq evinə çəkilmiş və onu tək başına evində qılmışdır.

Səhabələr də kimiləri tək başlarına, kimiləri də kiçik camaatlar halında, bu namazı qılmağa davam etmişlərdir. Rəsulullah (ﷺ) də Ramazanın son 10 gününün tək olan gecələrində etiqaf'da ikən yanında olan bir-iki nəfərlə bu namazı yenə camaat halında qılmışdır.

Rəsulullah (ﷺ), ayrıca bir çox hədisdə oruc gecələrini iqamə etməyi (namazla ihya etməyi) nəsihət etmiş, bunu etmənin böyük bir savab daşıdığını söyləmiş və beləcə təravih namazına təşviq etmişdir.

Qaldı ki, Rəsulullah (ﷺ), rəşidi xəlifələrin sünnətinə (tətbiqatlarına) tabe olmağı əmr etmiş və bununla onların sünnətinin (tətbiqatının) bidət məfhumuna daxil olmadığını ortaya qoymuşdur.

•2• Bunlardan bir digəri, məscidlərdə sistemli bir şəkildə vaaz (məscidlərdə dini söhbətlər) edilməsidir. Rəsulullah (ﷺ), sistemli bir şəkildə vaaz etməzdi. O, hər cümə günü xütbə oxuyar, bunun xaricində isə, ara-sıra və ehtiyac duyduqca vaaz edərdi.

Lakin özündən sonra ehtiyac yarandığında, səhabələr vaxtından etibarən sistemli bir şəkildə vaaz vermə yoluna gedildi.

Sistemli vaaz edən səhabələrdən biri, Abdullah b. Məsud (رضى الله عنه) 'dur. Bu səhabə, hər cümə axşamı günü vaaz etmiş və insanlara dini anlatmışdır.

Abdullah b. Abbas (رضى الله عنه) da vaaz etmək istəyənlərə bunu söyləyərdi:

"Həftədə bir dəfə vaaz edin. Ehtiyac və istək görsəniz, iki dəfə vaaz edin. Daha çox vaaz etmək istəsəniz, sayını üçə çıxarın.

Lakin bundan daha çox vaaz edərək insanları vaaz dinləməkdən bezdirməyin."

Hz. Aişə (radiyallahu anha) anamız da, Mədinə vaizi İbn-i Əbi's-Saib'ə eynilə Abdullah İbni Abbas (رضى الله عنه)kimi nəsihət etmiş və ona belə demişdi:

Bir gün vaaz ver, digər gün də camaata istirahət etdir.

Həsən əl-Bəsri (رحمه الله) belə deyir:

Sistemli bir şəkildə vaaz vermək, bidətdir. Ancaq o nə gözəl bidətdir. Onun sayəsində neçə-neçə dualar edilər, neçə-neçə ehtiyaclar ortadan qaldırılar və neçə-neçə gözəl dostluqlar qurular.

İmam Şafei (رضى الله عنه):

Bidət, mədh edilən və pislənən olmaq üzərə 2 qisimdir. Sünnətə tərs düşən bidət isə, pislənən bidətdir.

demiş və Hz. Ömər (رضى الله عنه)'in camaatla qılınan təravih üçün:

'Bu, nə gözəl bidətdir.' sözünü dəlil olaraq göstərmişdir.

Sünnətə uyğun olan bir şeyə bidət demək, sadəcə şəkli etibarı ilə yeni olmasından dolayıdır. Çünki bu şey,

mənası və ruhu etibarı ilə sünnətdə və şəriətdə mövcuddur. Bu səbəblə, bu şey, dindən xaric bir şey deyildir.

İmam Şafei (رضى الله عنه), bidətləri ikiyə ayıran bu sözünü başqa bir yerdə daha açıq bir şəkildə belə təkrarlamışdır:

Yeni ortaya çıxarılan şeylər iki qisimdir. Bir qismi, Qurana, sünnətə, əshabın görüşlərinə və ümmətin icmaına tərs düşən şeylərdir. Bu şeylər bidət və dəlalətdirlər.

Bir qismi isə, zikr edilən qaynaqlara tərs düşməyən xeyir növündən olan şeylərdir. Bu şeylər, yeni də olsalar, bidət və dəlalət deyildirlər."

Bu sözdən də anlaşıldığı kimi, bir şeyin bidət olub olmadığını təyin edən ölçü, onun Quran, Sünnət, səhabələrin görüşü və ümmətin icmaına uyğun olub və ya olmamasıdır.

Rəsulullah (ﷺ) və 4 rəşidi xəlifə vaxtında, dində bidət yox idi. Bidət, bu dönəmdən sonra baş göstərdi...

(İbn Rəcəb əl-Hənbəli, Camiu'l-Ulum və'l-Hikəm, 28-ci hədis: "İtaət etmək, Sünnətə tabe olmaq və Bidətlərdən uzaq durmaq haqqındadır.", 2. Cild, s. 142-152)

* * *

Aişə (radiyallahu anha)'dan rəvayət edildiyinə görə, o, belə demişdir:

Rəsulullah (ﷺ) Ramazanın son 10 günündə ibadətlər xüsusunda, başqa zaman göstərmədiyi ciddi bir səy göstərərdi.

---------------

Hz.Aişədən (radiyallahu anha) rəvayət edildiyinə görə, o, belə demişdir:

Ramazanın son 10 günü girincə, Peyğəmbər (ﷺ) gecəsini ihya edər, izarını sıxar (ciddi bir səy göstərər) və ailə fərdlərini (ibadət üçün) oyandırardı.[1]

İzahı:

İlk hədisi, Muslim (رحمه الله), Tirmizi (رحمه الله), İmam Əhməd (رحمه الله) də rəvayət etmişlərdir.

İkinci hədisi, Tirmizi (رحمه الله) xaric Kütüb-ü Sittə (Buxari, Muslim, Əbu Davud, ibn Macə, Nəsai) sahibləri və Beyhaqi (رحمه الله) də rəvayət etmişlərdir.

Hədislərin Qədr gecəsini axtarmaq üçün və ya daha çox ibadət etmək üçün Ramazanın son 10 günü ciddi bir şəkildə çalışdığını və başqa zaman göstərmədiyi səyi, bu 10 gündə göstərdiyinə dəlalət edirlər.

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu's-Siyam (Oruc kitabı): Ramazan ayının son on gününün fəziləti haqqındakı bab, hədis no: 1767-1768

Əl-Mənhəl əsərinin müəllifi, ikinci hədisin açıqlaması bəhsində belə deyir:

Yəni Rəsulullah (ﷺ) Ramazanın son 10 günündə gecənin çoxunu ibadətlə keçirirdi. Çünki gecə namazı bəhsində rəvayət edilən bir hədisdə, Hz. Aişə anamız (radiyallahu anha):

O, heç bir gecəni sabaha qədər ibadətlə keçirməmişdir. demişdir.

İmam Nəvəvi (رحمه الله) isə, bu haqda belə deyir:

Hz.Aişə (radiyallahu anha)'nın: "Peyğəmbər (ﷺ) gecəni ihya edərdi"

sözünün mənası- gecənin tamamını namaz və sair ibadətlə keçirirdi, deməkdir.

Dostlarımızın (Şafei uləmanın), gecənin tamamını ibadətlə keçirmənin məkruhluğuna dair sözlərinə gəlincə isə, bu sözün mənası:

İl boyunca belə etməkdir. Dostlarımız (Şafei alimlər), bir-iki gecə və ya 10 gecəni sabaha qədər ibadətlə keçirmənin məkruh olduğunu söyləməmişlərdir. Bunun üçündür ki, hər 2 bayram gecəsinin tamamını və başqa gecələri ibadətlə ihya etmənin müstəhəbliyi üzərində ittifaq etmişlərdir."

Mi'zər: Beldən aşağı geyilən paltara deyilir. Bunun digər bir adı da: İzar'dır.

Hədisdə Rəsulullahın (ﷺ) bu 10 gün girdiyi zaman, izarını sıxdığı bildirilir. Bu cümlə, ibadət xüsusunda sair

zamanlardakı adətindən daha çox və ciddi çalışmasından kinayədir.

Və ya xanımlarından uzaq qalmasından kinayədir.

Xattabi (رحمه الله) ‘nin dediyi kimi, zikr edilən hər iki məna, bununla bərabər, cümlənin həqiqi mənası da qəsd edilmiş ola bilər.

Hədisin: “ailə fərdlərini oyandırardı.” cümləsindən məqsəd, ailə fərdlərindən gecə ibadətinə qalxmağa gücü yetən ailə fərdlərini oyandırmaqdır. Muhamməd b. Nasr’ın Zeynəb bint-i Ümmü Sələmə (radiyallahu anha)’dan olan bir rəvayətində “güc yetirməsi” qeydi vardır.

* * *

Əbu Səid əl-Xudri (رضى الله عنه) ‘dan belə rəvayət edilir:

Bir il (Qədr gecəsini axtarmaq üçün) Rəsulullah (ﷺ) ilə bərabər Ramazan’ın ortasındakı 10 gecə (gündüzləri il bərabər) etiqaf etdik. Rəsulullah (ﷺ) 20-ci günün sabahı etiqaf yerindən çıxaraq bizə):

“(Yuxuda) mənə Qədr gecəsi(nin bütün əlamətləri) göstərildi. Sonra unutturuldu. Sizlər Qədr gecəsini Ramazan’ın son 10 gününün tək gecələrində axtarın.” buyurdu.

(İbn Macə, Sünəm tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): Qədr gecəsi(nin hansı gecə olduğu) haqqındakı bab, hədis no: 1766)

---------------

İzahı:

Buxari (رحمه الله), Muslim (رحمه الله), Malik (رحمه الله), Əbu Davud (رحمه الله)və Nəsai (رحمه الله) də bunu rəvayət etmişlərdir. Mörtərizə içindəki ifadələr, digər rəvayətlərdən istifadə edilərək əlavə edilmişdir.

Qədr kəliməsi, fərqli mənalara gəlir.

• Bunlardan biri, qiymət və şərəfdir. Bu gecədə edilən ibadətlərin savabı, içində Qədr gecəsi olmayan 1000 ayda ediləcək ibadətlərin savabından üstün olduğu üçün, bu gecəyə “Qədr” ismi verilmişdir. Və ya bu gecə, ibadət edən mömin, üstün qiymət və şərəf qazandığı üçün, gecəyə bu isim verilmişdir.

• Qədr kəliməsinin ikinci mənası, təqdir və təyin etməkdir. Gecəyə bu ismin verilməsinin səbəbi budur:

Bu gecədən etibarən bir ilə qədər olan zamanda insanların qarşılaşacağı ölüm, ruzi kimi bütün hadisələr, Allah tərəfindən vəzifəli mələklərə bildirilir. Və hər mələyə, görəcəyi iş üçün əmr verilir.

Sözü mötəbər olan bütün alimlər, Qədr gecəsinin varlığına və qiyamətə qədər hər il təkrarlandığına icma etmişlərdir.

Əl-Mənhəl əsərinin müəllifi İmam Subqi (رحمه الله), fərqli hədislərə dayanaraq verdiyi məlumata görə, Qədr gecəsinin bu əlamətləri vardır:

1- Qədr gecəsinin sabahı, günəş doğarkən bəyaz və göz qamaşdırmayacaq tərzdə pak və bir ləyən şəklində görülür. Səbəbi də, o gecə sabaha qədər çox sayda mələk yerə enər və göylərə çıxarlar. Mələklərin izdihamı dolayısı ilə, günəşin şiddətli işığı, sanki kölgələnmiş kimi olur.

2- Qədr gecəsi, çox sakit olur. Nə çox soyuq, nə də çox isti olur.

3- Qədr gecəsində, sabaha qədər ulduz düşməsi görülməz.

4- Hər şey o gecədə səcdə edər.

İmam Təbəri (رحمه الله)'nin bir camaatdan rəvayət etdiyinə görə, o gecə ağaclar səcdə edərcəsinə yerə əyilər və doğrular.

Muslim'in Əbu Said əl-Xudri (رضى الله عنه)'dən rəvayət etdiyinə görə, Rəsulullah (ﷺ) Qədr gecəsini axtarmaq üzərə Ramazan'ın ilk 10 günü etiqafa girmiş, sonra ikinci 10 günü etiqafa girmiş, daha sonra:

Qədr gecəsinin Ramazan'ın son 10 günündə olduğu mənə deyildi. Bu son 10 gündə etiqaf etmək istəyənlər, etiqaf etsinlər." buyurdu. Bunun üzərinə səhabələr, Rəsulullah (ﷺ) 'lə bərabər etiqafa girdilər.

Hədisdə bildirildiyi kimi, Rəsulullah (ﷺ), yuxusunda Qədr gecəsinin hansı gecə olduğunu və əlamətlərini görmüş, sonra hansı gecə olduğu Allah tərəfindən unutdurulmuşdur. Unutdurulma səbəbi haqqında, Buxari'nin rəvayət etdiyi bir hədisdə, Ubadə b. Samit (رضى الله عنه) belə deyir:

Rəsulullah (ﷺ) Qədr gecəsinin hansı gecə olduğunu bizə xəbər vermək üçün çıxdı, amma iki müsəlmanın dalaşdığını gördü və:

Mən, Qədr gecəsini sizə xəbər vermək üçün çıxdım, ancaq filan və filan adam dalaşırdı. Bunun üzərinə Qədr gecəsi (bildirilməsi) qaldırıldı. Qaldırılmasının sizin üçün daha xeyirli olduğu umular. Artıq siz o gecəni Ramazan'ın 29, 27 və 25-ci gecələrində axtarın buyurdu.

Qədr gecəsinin təyin edilməməsinin hikməti bu ola bilər:

Möminlər o gecəni tanısa idilər, yalnız o gecəni ihya etməklə kifayətlənib digər gecələrin ihyasını buraxa bilərdilər.

Hədis, Qədr gecəsinin, Ramazan'ın son 10 gününün tək gecələrində axtarılmasını əmr etmişdir.

Qədr gecəsinin, Ramazan'ın hansı gecəsində olduğuna dair fərqli rəvayətlər vardır. 17, 21, 23, 25, 27, 29-cu gecələrinə aid rəvayətlər olduğu kimi, 22, 24 və 26-cı gecələrinə aid rəvayətlər də vardır.

İmam Subqi (رحمه الله)'nin dediyinə görə, bəzi alimlər, bu rəvayətlərin sayını 44-ə çıxarmışlardır.

Ən qüvvətli rəvayət isə, 27-ci gecəyə aid olan rəvayətdir.

* * *

إِنَّا أَنزَلْنَاهُ فِى لَيْلَةِ الْقَدْرِ ﴿١﴾

1- “Doğrusu, Biz onu Qədr gecəsində endirdik.”

---------------

Hər nə qədər bu surədə, hələ Quran’dan bəhs edilməmiş isə də, mənanın belə olduğu bilinən bir xüsusdur. Uca Allah belə buyurur:

“O Ramazan ayı ki, Quran onda endirilmişdir.” (Bəqərə/185)

Bir başqa yerdə də belə buyurmaqdadır:

“Ha mim. Açıq-aydın kitaba and olsun ki, şübhəsiz Biz onu mübarək bir gecədə endirdik.” (Duxan/1-3)

Allah’ın bu buyuruğunda “mübarək gecə”dən məqsəd- Qədr gecəsidir.

Bir görüşə görə, Cəbrayıl (əleyhissəlam), Quranı bir dəfədə, bütünü ilə Qədr gecəsində Lövh-i Məhfuz’dan dünya səmasındakı *Beytu’l-İzzə’yə endirmişdir. Cəbrayıl, Quranı yazıcı mələklərə yazdırmış, daha sonra da Allah Rəsulu (sallallahu aleyhi və səlləm)’ə qisim-qisim endirməyə davam etmişdir.

Quran’ın ilk nazil olmağa başlaması ilə son nazil olan ayət arasında 23 illik bir zaman keçmişdir. Bu açıqlamanı ibn-i Abbas vermişdir.

*Beytu’l-İzzə: İzzət evi mənasına gələn Beytu’l-İzzə, Quranın bir bütün halında endirildiyi dünya səmasında (yerə ən yaxın göydə) mövcud olan yerin adıdır.

---------------

Qədr gecəsinə, təqdir gecəsi də deyilmişdir.

1) Ona bu ismin veriliş səbəblərindən biri budur:

Uca Allah'ın bu gecədə, gələcək il eyni gecəyə qədər, Öz əmrindən olan: ölüm, əcəl, ruzi və daha başqa xüsusları dilədiyi şəkildə təqdir buyurmasıdır. Sonra bunu, işləri çəkib-çevirən mələklərə təslim edər. Bunlar da 4 mələkdir:

"Cəbrail, Mikail, İsrafil və Əzrail."

Yenə ibni Abbas'dan belə deyildiyi rəvayət edilmişdir:

"Uca Allah, Şaban'ın yarısına rastlayan gecədə meydana gələcək hadisələrə dair qəza və hökmlərini təqdir buyurur və bunları Qədr gecəsində bununla vəzifəli mələklərə təslim edər."

2) Bu gecəyə Qədr gecəsi deyilməsinin digər səbəbi:

Əzəməti, qədri və şərəfi dolayısı ilə olduğu söylənmişdir.

Filan adamın şərəfi və üstün bir mövqeyi vardır mənasında 'filankəsin qədri vardır.' şəklindəki (ərəblərin) təbirlərindən alınmışdır.

Bu açıqlamanı Zühri və başqaları gətirir.

3) Bu gecəyə bu ismin verilmə səbəbinin:

Bu gecədə edilən ibadətlərin çox böyük bir qədri və çox savab və mükafatı olduğu da söylənmişdir.

4) Bir digər açıqlamaya görə, bu gecəyə bu adın verilmə səbəbi budur:

“Bu gecədə üstün bir qədri (dəyəri) olan Kitab’ın (Quranın), yenə üstün bir qədri (dəyəri) olan Rəsula endirilməsidir.

5) Bir digər səbəbə görə:

“Bu gecədə qədri olduqca yüksək və əhəmiyyətli olan mələklərin enməsidir.”

6) Bir başqa açıqlamaya görə:

“Bu gecədə Allah, möminlərə rəhmətini təqdir buyurmuşdur.”

---------------

وَمَا أَدْرَاكَ مَا لَيْلَةُ الْقَدْرِ ﴿٢﴾ لَيْلَةُ الْقَدْرِ خَيْرٌ مِّنْ أَلْفِ شَهْرٍ ﴿٣﴾

2- “Sən nə bilirsən (hardan bilirsən) ki, Qədr gecəsi nədir?!”

3- “Qədr gecəsi, 1000 aydan daha xeyirlidir.”

---------------

1) Bu ayət, gecənin fəzilət və böyüklüyünü açıqlamaqdadır. Zamanın fəziləti, o zaman içərisində çox fəzilətli hadisələrin meydana gəlməsi səbəbi ilədir. Bu gecədə, bənzəri 1000 ayda olmayan çox xeyir paylaştırılar. Doğrusunu Allah bilər.

2) Müfəssirlərin bir çoxu da belə deyirlər:

“Yəni bu gecədə edilən əməl, içində Qədr gecəsi olmayan 1000 ayda ediləcək əməldən daha xeyirlidir.

3) Qədr gecəsi, özündə Qədr gecəsi mövcud olmayan 1000 aydan daha xeyirlidir, deyənlər də olmuşdur.

4) 1000 ay ilə uca Allah'ın, zamanın bütününü qəsd etdiyi də söylənmişdir. Çünki ərəblər, 1000 rəqəmini əşya ilə bağlı ən iləri nöqtə haqqında istifadə edirlər. Necə ki, uca Allah:

"Sən onları (yəhudiləri) bütün insanlardan, hətta müşriklərdən də daha artıq yaşamağa həris görərsən. Onlardan hər biri istər ki, min il yaşasın, halbuki (uzun ömür) onların heç birini axirət əzabından uzaqlaşdırmaz. Allah onların nə etdiklərini görəndir!" (Bəqərə/96) deyə buyurmaqdadır ki, bundan məqsəd "zaman boyunca"dır.

Deyildiyində görə, keçmiş vaxtlarda, abid bir nəfərə, Allaha 1000 ay, Yəni 83 il 4 ay müddətlə ibadət etmədiyi müddətcə, abid deyilməzdi. Uca Allah, Muhamməd (sallallahu aleyhi və səlləm)'in ümmətinə bir gecə ibadət etməyi, keçmiş qövmlərin ibadətlərlə keçirdikləri 1000 aydan daha xeyirli qılmışdır.

İbn Məs'ud belə deyir:

Peyğəmbər (sallallahu aleyhi və səlləm), İsrail oğulları arasından Allah yolunda silahlı olaraq 1000 ay cihad edən bir adamdan söz etti. Müsəlmanlar bu işə heyrət etdilər. Bunun üzərinə:

"Doğrusu, Biz onu Qədr gecəsində endirdik... Qədr gecəsi, bu şəxsin Allah yolunda silahlandığı 1000 aydan daha xeyirlidir."

Buna bənzər bir açıqlama, ibn Abbas'dan da nəql edilmişdir.

Malik, Muvatta'da ibnu'l-Qasım və başqalarından gələn rəvayət yolu ilə belə deyir:

"Güvəndiyim kəsləri belə deyərkən dinlədim:

Allah Rəsulu (sallallahu aleyhi və səlləm)'ə özündən öncəki ümmətlərin ömürləri göstərildi. Uzun ömürləri boyunca başqalarının nail olduqlarının bənzərlərinə, ümmətinin əməl etibarı ilə onlara yetişə bilməyəcək fikri ilə, ümmətinin (fərdlərinin) ömürlərini qısa gördü. Uca Allah ona Qədr gecəsini verdi və onu 1000 aydan daha xeyirli qıldı."

---------------

تَنَزَّلُ الْمَلَائِكَةُ وَالرُّوحُ فِيهَا بِإِذْنِ رَبِّهِم مِّن كُلِّ أَمْرٍ ﴿٤﴾

4- "O gecə mələklər və ruh, Rəbbinin izni ilə hər bir işdən dolayı yerə enərlər."

---------------

Mələklər yerə enərlər və dan yeri ağarıncaya qədər, insanların etdikləri dualara amin deyərlər. Bax, Uca Allah'ın: 'O gecə mələklər enər.' buyuruğu, bunu anlatmaqdadır.

"Və Ruh, Rəbbi'nin iznilə..."

Ruhdan məqsəd, Cəbrail'dir.

Əl-Kuşeyri'nin nəql etdiyinə görə, "ruh" mələklərdən bir sinifdir. Bunlar, digərlərinin qoruyucuları olaraq yaradılmışlardır. Bizim mələkləri görmədiyimiz kimi, mələklər də bunları görməzlər.



Bunların, mələklər xaricində Allah'ın ordularından

bir ordu olduğu da söylənmişdir. Bu açıqlamanı, Mücahid, ibn Abbas'dan mərfu bir rəvayət (sənədi qüvvətli olsun və ya olmasın Peyğəmbərə isnad edilən rəvayət) olaraq nəql edilmişdir. Bunu əl-Mavərdi zikr etmişdir.

Kuşeyri'nin nəql etdiyinə görə, bunların Allah'ın yaratdıqlarından bir növ olduğu da söylənmişdir. Bunlar yemək yeyərlər, əlləri və ayaqları vardır, mələk deyillərdir.

"Ruh"un tək başına bir saf olaraq duracaq böyük bir məxluq olduğu da söylənmişdir.

"Ruh'un, Cəbrail'in bu gecədə, bu gecənin əhalisi üzərinə sair mələklərlə birlikdə endirdiyi rəhmət olduğu da söylənmişdir."

Bunun dəlili isə:

"O, öz əmri ilə dilədiyi qullarından dilədiyi kimsələr üzərinə ruhu endirir." (Nəhl/2) buyuruğu olub "rəhmət endirir." deməkdir.

"Rəbbi'nin izni ilə hər bir işdən dolayı enərlər."

"Uca Allah'ın təqdir edib, bu ildən gələcək ilə qədər hökmə bağladığı verilən hər bir əmr ilə enər." deməkdir.

Bu açıqlamanı, ibni Abbas vermişdir.

(1- İmam Qurtubi, əl-Cami li Ahkami'l-Quran, Qədr surəsi təfsiri)

---------------

سَلَامٌ هِيَ حَتَّىٰ مَطْلَعِ الْفَجْرِ ﴿٥﴾

5- “O gecə dan yeri sökülənə kimi əmin-amanlıqdır!”
---------------

Mücahid ayət haqqında belə deyir:

“O gecə hər hansı bir bəla, ya da şeytanın çalışmasından uzaqdır. Qədr gecəsi, hər hansı bir bəlanın gerçəkləşmədiyi və şeytanların göndərilmədiyi bir gecədir. Şeytan o gecədə, hər hansı bir pislik edə, sıxıntı yarada bilməz.”

Dahhaq, ibn Abbas’ın belə dediyini rəvayət edər

“O gecə, üsyankar olan cinlər və cinlərdən ifrit olanlar bağlanar. Bütün səma qapıları açılar və Allah Taala, tövbə edən hər qulunun tövbəsini qəbul edər. Bunun üçün O, belə buyurur:

“O gecə, dan yeri sökülənə kimi əmin-amanlıqdır!”

Ubey b. Ka’b (radiyallahu anh)’ın belə dediyi rəvayət edilmişdir:

“Şeytan o gecə hər hansı bir kimsəyə, fəsad iplərindən vura bilməz. O gecə sehrbazın (cadugərin) sehri də təsirli ola bilməz.”

Zəif bir isnadla Ənəs’dən mərfu olaraq (sənədi qüvvətli olsun və ya olmasın Peyğəmbərə isnad edilən hədis), bu hədis rəvayət edilir:

“O gecə, ulduz düşməz, itlər hürməz.”

Bütün bunlar, şeytanların yer üzündə yayılmasının əngəlləndiyinə işarət edər.

Ey Adəm oğlu! Əgər canının dəyərini biləcək olsaydın, günahlarla özünə xəyanət etməzdin.

Sən varlıqlar içərisində iradəsi olan bir varlıqsan. Cənnət sənin üçün hazırlandı. Əgər uzaq durarsansa, müttəqilərin yerinə keçərsən.

Dünya, İblis'in yurdudur. O yurtdan ayrılmağa və İblis'in yaxınında durmağa, sabah onun qrupu arasında yer almağa necə razı olursan?

Allah, atamız Adəm'ə səcdə etməkdən uzaq durduğunu görə, onu səmadan qovdu. Allah, sənin yaxınlığını istədi. Amma sən özünə, Allah'ın düşmənini dosd, dostunu da düşmən tutdun.

"(Ya Rəsulum!) Xatırla ki, bir zaman mələklərə "Adəmə səcdə edin!" – demişdik. İblisdən başqa hamısı səcdə etdi. O, cinlərdən (cin tayfasından) idi. O öz Rəbbinin əmrindən çıxdı. Onlar sizin düşməniniz olduğu halda, siz Məni qoyub onu və nəslini (övladını özünüzə) dostmu tutursunuz? Bu, zalımlar üçün necə də pis dəyiş-düyüşdür!" (Kəhf/50)

(2- ibn Rəcəb əl-Hənbəli, Ravaiu't-təfsir əl-Camiu li təfsiri'l-imam ibn Rəcəb əl-Hənbəli, Qədr surəsi 5-ci ayətin təfsiri, 4. Cild, s. 420)

--------------

1- Qədr gecəsinin təyini:

Qədr gecəsinin müəyyən olaraq hansı gün olduğu xüsusunda elm adamlarının fərqli görüşləri vardır. Böyük çoxluğun qəbul etdiyi görüşə görə, Qədr gecəsi 27-ci gecədir.

Çünki Zirr b. Hubeyş'dən rəvayət edilən hədisə görə, o belə demişdir:

“Mən, Ubey b. Ka’b’a dedim ki: qardaşın Abdullah ibn Məs’ud belə deyir:

‘Kim bir il boyunca (gecələri) namaz qılarsa, Qədr gecəsinə rastlar.’

Bunun üzərinə Ubey b. Ka’b belə dedi:

‘Allah, Əbu Abdurrahmana (ibn Məs’uda) məğfirət etsin. O, bu gecənin Ramazan’ın son 10 günündə olduğunu və bunun 27-ci gecə olduğunu bilir. Lakin o, insanların buna bel bağlamamasını istəmişdir.’

Daha sonra o qəti bir şəkildə and içərək:

‘O, Qədr gecəsinin 27-ci gecə olduğunu ifadə etmişdir.’

Mən ona:

‘Ey əbu’l-Munzir (Ubey b. Ka’b’ın künyəsidir.) bunu nəyə dayanaraq söyləyirsən?’ dedim.

Belə cavab verdi:

‘Bunu Allah Rəsulu sallallahu aleyhi və səlləm’in bizə xəbər verdiyi dəlilə dayanaraq -yaxud da bildirdiyi əlamətə görə- xəbər verirəm ki, o gün günəş (gözləri qamaştıracaq qədər) bir parıltısı olmadan doğar.

Tirmizi:

‘Bu həsən-səhih bir hədisdir.’ demişdir.

Bu hədisi Muslim də rəvayət etmişdir.

Bu gecənin, ilin digər ayları bir tərəfə, yalnızca Ramazan ayında olduğu da söylənmişdir. Bu, Əbu Hureyrə və başqalarının görüşüdür.

İmam Azam Əbu Hənifə də, Qədr gecəsinin ilin bütünündə gizli olduğu görüşünü mənimsəmişdir. Ondan belə deyildiyi nəql edilir:

‘Bu gecə, sadəcə bir dəfə olmuş və bitmişdir. Ancaq doğrusu, bu gecənin qalmağa davam etdiyidir.’

Yenə ibn Məsud’dan rəvayət edildiyinə görə, Qədr gecəsi əgər bu il hər hansı bir gündədirsə, gələcək il başqa bir gündədir.

Ancaq Cumhurun qənaətinə görə, Qədr gecəsi, hər ilin Ramazan ayındadır.

Digər tərəfdən Qədr gecəsinin Ramazan ayının ilk gecəsi olduğu da söylənmişdir. Bu, Əbu Rezin əl-Ukayli’nin görüşüdür.

---------------

Əl-Həsən, ibn Ishaq və Abdullah b. Zubeyr belə demişlərdir:

“O, Ramazanın 17-ci gecəsidir. Sabahında Bədr döyüşünün baş verdiyi gecə də odur.”

Onlar bu qənaətə, Uca Allah’ın:

“(Ey mö’minlər!) Əgər siz Allaha və haqla batilin ayırd edildiyi gün – iki dəstənin bir-birilə qarşılaşdığı gün (Bədr günü) bəndəmizə (Muhəmmədə) nazil etdiyimizə iman gətirmisinizsə...” (Ənfal/41)

ayətindən yola çıxaraq bu qənaətə varmış kimi görsənirlər. Bu da 17-ci gecə(nin gündüzü) olmuşdu.

---------------

Qədr gecəsinin 19-cu gecə olduğu da söyləmişdir.

Ancaq səhih və məşhur olan, Qədr gecəsinin Ramazan'ın son 10 gecəsində olduğudur. Malik, Şafii, Əbu Sevr və Əhməd'in görüşü budur.

---------------

Bir başqa qrupun qənaətinə görə, Qədr gecəsi, 21-ci gecədir. İmam Şafi də bu görüşə meyl etmişdir. Buna səbəb isə, Əbu Said əl-Xudri'nin rəvayət etdiyi, Malik və başqalarının da öz kitablarında qeyd etdikləri, su və palçıqdan bəhs edən hədisdir.

---------------

Qədr gecəsinin Ramazan'ın 23-cü gecəsi olduğu da söylənmişdir. Çünki ibn Ömər'in rəvayət etdiyinə görə, bir adam belə dedi:

'Ey Allahın Rəsulu! Mən, Qədr gecəsini Ramazanın bitməsinə 7 gecə qalmış olan gecədə gördüm.'

Allah Rəsulu (sallallahu aleyhi və səlləm):

'Bu adam, (Qədr gecəsinin) 23-cü gecəyə rastlayan bir yuxu görmüşdür. Hər kim, bu ayda hər hansı bir gecəni namazla keçirmək istərsə, 23-cü gecəni ihya etsin.'

Mamər isə, belə deyir:

'Əyyub, 23-cü gecə qüsl alar və xoş qoxular istifadə edərdi.'

Muslim'in Səhih'ində, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'dən belə dediyi rəvayət edilməkdədir:

"Mən yuxuda özümü, Qədr gecəsinin sabahında,

su və palçıq içində səcdə edərkən gördüm.

---------------

Qədr gecəsinin Ramazanın 25-ci gecəsi olduğu da söylənmişdir. Çünki Əbu Said əl-Xudri'nin rəvayət etdiyi hədisə görə, Allah Rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

"Siz o gecəni, son 10-cu gecədə, 9-cu gecədə, 7-ci gecədə, 5-ci gecədə axtarın.'

Bu hədisi, Muslim rəvayət etmişdir.

Malik deyir:

• Doqquzuncu gecə ilə qəsd etdiyi (ayın) 21-ci gecəsi;

• Yeddincisi ilə qəsd etdiyi (ayın) 23-cü gecəsi;

• Beşinci gecə ilə qəsd etdiyi (ayın) 25-ci gecəsidir.

---------------

Qədr gecəsinin 27-ci gecə olduğu da söylənmişdir ki, bunun dəlilini daha öncə zikr etdim. Bu, Əli, Aişə, Müaviyə və Ubey b. Ka'b'ın görüşüdür.

İbni Ömər'in rəvayətinə görə, Allah Rəsulu (sallallahu aleyhi və səlləm)'i belə buyurarkən eşitdim:

"Qədr gecəsi, 27-ci gecədir."

Əbu Bəkr əl-Vərraq isə, belə deyir:

"Uca Allah, bu ayın -yəni Ramazan ayının- gecələrini, bu surənin (Qədr surəsinin) kəlimələrinə bölmüşdür. 27-ci kəliməyə çatınca ona işarət edərək "o" deyə buyurmuşdur.

Eyni şəkildə Qədr gecəsi 3 dəfə zikr edilmişdir və 9 hərfdir. Bunların cəmi də 27 etməkdədir.”

---------------

Qədr gecəsinin 29-cu gecə olduğu da söylənmişdir. Çünki Peyğəmbər (sallallahu aleyhi və səlləm)’in belə buyurduğu rəvayət edilmişdir:

“Qədr gecəsi 29-cu -yaxud 27-ci- gecədir. Mələklərin bu gecə sayları çınqıl daşları qədərdir.”

---------------

Qədr gecəsinin cüt gecələrdə olduğu da söylənmişdir.

Əl-Həsən dedi ki:

“Mən 24-ci gecə(nin sabahının) günəşini 20 il müddətlə izlədim. Gördüm ki, günəş (qamaşdırıcı) işığı olmayan bəyaz bir şəkildə doğurdu.”

Bununla o gecədə ki buraların çoxluğundan dolayı, günəşin belə olduğunu qəsd etməkdədir.

---------------

Qədr gecəsinin bütün il içərisində gizli olduğu da söylənmişdir. Beləliklər, hər kəs bütün gecələri ihya etmək üçün səy göstərsin.

---------------

Allah’ın, bu gecəni Ramazan ayının bütünü də gizlətdiyi də söylənmişdir.

Beləliklə Ramazan ayı boyunca onu (qədr gecəsini) idrak etmək ümidi ilə bütün gecələr, çoxca əməl və ibadətlə keçirilsin.

Eynilə

• Digər namazlar arasında orta namazı;

• Əsmau'l-Hüsnası (Allahın bütün gözəl isimləri) arasında İsm-i Azam'ını (Allahın ən böyük ismini);

• Qəzəbini günahlarda;

• Razılığını itaətlərdə;

• Müəyyən edilmiş bir vaxdı sair vaxtlar arasında;

• Saleh qulunu digər qullar arasında;

Rəhmətinin bir gərəyi və bir hikməti olaraq saxlaması kimi...

---------------

2- Qədr gecəsinin əlamətləri:

Gecənin sabahında günəşin göz qamaşdırıcı bir parıltısı olmadan bəyaz olaraq doğmasıdır.

Əl-Həsən dedi ki:

Allah Rəsulu (sallallahu aleyhi və səlləm) Qədr gecəsi haqqında belə buyurmuşdur:

"Qədr gecəsinin əlamətləri arasında bunlar da vardır:

• O gecə aydınlıq və xoş bir gecədir.

• O gecə nə isti, nə də soyuqdur.

• O gecənin sabahında günəş, (gözləri qamaşdıran) işıqları olmadan doğar."

---------------

3-Qədr gecəsinin fəzilətləri:

Uca Allah’ın:

“Qədr gecəsi 1000 aydan daha xeyirlidir.”

və:

“Onda mələklər və ruh enər” buyurması,

(fəzilətini anlatmaq üçün) yetərlidir.

Buxari və Muslim’də də belə buyurulmuşdur:

“Hər kim Qədr gecəsini (mükafatına) inanaraq, (əcrini) umaraq namaz qılmaqla (və sair ibadətlərlə) ihya edərsə, onun keçmiş (kiçik) günahları bağışlanar.”

Bu hədisi Əbu Hureyrə rəvayət etmişdir.

İbni Abbas dedi ki:

Allah Rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurur:

“Qədr gecəsi olduğunda, aralarında Cəbrail’in də olduğu Sidrətu’l-Müntəha’da sakin olan mələklər, ard-arda enərlər. Bərabərlərində bəzi sancaqlar (bayraqlar) olur. Bu sancaqlardan:

• biri mənim qəbrimin üzərinə;

• biri Beytu’l-Maqdis’in üzərinə;

• biri Məscid-i Haram’ın üzərinə;

• biri Tur-u Sina’nın üzərinə dikilər.

Salam vermədikləri mömin kişi və qadın buraxmazlar. İçki içən, donuz əti yeyən və zəfərana bulaşan kimsələr müstəsna.”

Ubeydullah b. Amir b. Rabia'nın rəvayət etdiyinə görə, Allah Rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

"Hər kim Qədr gecəsində, məğrib və işa namazlarını camaatla birlikdə qılarsa, artıq o kimsə Qədr gecəsindən payına düşəni almış olar."

Bu hədisi, Saləbi, təfsirində zikr etmişdir.

Aişə (radiyallahu anha) dedi ki:

"Ey Allah'ın Rəsulu! Əgər Qədr gecəsinə rast gəlsəm, nə deyim?" diyə soruşdum.

Belə buyurdu:

"Allahummə, innəkə əfuvvun kərimun tuhibbu'l-əfvə fə'fu ənni."

"Allah'ım! Şübhəsiz Sən çox əfv edənsən, əfv etməyi sevirsən, məni də əfv et, de." diyə buyurdu.

Qədr surəsi burda sonlanır. Allaha həmd olsun.

(3- İmam Qurtubi əl-Cami li Ahkami'l-Quran, Qədr surəsi təfsiri)

* * *

Əbu Umamə (رضى الله عنه) ‘dan rəvayət edildiyinə görə, Rəsulullah (ﷺ) belə buyurmuşdur:

Kim savabını Allah’dan umaraq (və sırf Onun rizası üçün) 2 bayram (Ramazan və Qurban bayramları) gecəsini ibadətlə iqamə (ihya) edərsə, qəlblərin öldüyü gün, onun qəlbi ölməyəcəkdir.[1]

Not: İsnadı zəifdir.

---------------

İzahı:

Bu hədisin açıqlaması bəhsində İmam Əbul Həsən əs-Sindi əl-Hənəfi (رحمه الله)belə deyir:

Hədisin zahirinə görə, 2 bayram gecəsinin tamamını ibadətlə keçirənlər, zikr edilən mükafata qovuşarlar. Bu 2 gecənin bütününü deyil, bir qismini təhəccüdlə yəni gecə ibadətilə keçirənlərin də bu mükafata qovuşmaları umulur.

Qəlblər, çox günah işləməklə ölürlər. Bayram gecələrini ihya edənlərin qəlbləri isə, ölməz.”

Əli bin Əhməd əl-Bulaki (رحمه الله), Camiu’s-Sağir şərhində, bu hədisin açıqlaması bəhsində belə deyir:

İmam Alqamə (رحمه الله): - Qəlblər öldüyü gün, onun qəlbi ölməyəcəkdir:- cümləsi, fərqli mənalarda izah edilmişdir.

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-siyam (Oruc kitabı): Ramazan və Qurban bayramının iki gecəsini iqamə (ihya) edən haqqındakı bab, hədis no: 1782

Bəzilərinə görə, bundan məqsəd, bu gecələri ihya edənlərin qəlbləri, dünya sevgisində boğulmaz. Çünki qəlbləri dünya sevgisinə boğulanlar, ölü sayılırlar. Necə ki, Rəsulullah (ﷺ):

"لا تدخلوا على هؤلاء الموتى"

Bu ölülərin yanına girməyin." buyurmuşdur. Ona (ﷺ) bunların kimlər olduğu soruşulduğunda:

"الاغنياء"

(Qəlbləri dünya sevgisinə boğulmuş) varlılar. buyurmuşdur.

Bəzilərinə görə, cümlədən məqsəd, bu 2 gecəni iqamə (ihya) edənlərin aqibətlərinin xeyir olacağıdır. Yəni imanla öləcəklərdir. Çünki:

"او من كان ميتا فاحييناه"

"...ölü ikən diriltdiyimiz (hidayət etdiyimiz)..."

ayətində, kafirə "ölü" deyilmişdir.

---------------

Hədisdəki mükafat, bu gecələrin çoxunu ibadətlə keçirmək surətilə hasil olur. Hətta Abdullah bin Abbas (رضى الله عنه) 'dan rəvayət edildiyinə görə, o, belə demişdir:

Bu gecələrin işa və sabah namazlarını camaatla qılanlar da bu mükafatı qazanarlar.

Camiu's-Sağir haşiyəsində əl-Hafni (رحمه الله) də belə deyir:

Hədis, bu gecələri ibadətlə ihya edənlərin, qiyamət günü qurtulacaq kəslərdən olacaqlarından kinayədir. Yəni qəlblərin həlak olacaqları qiyamət günü, bu gecələri ihya edənlərin qəlbləri həlak olmayacaqdır.

Hədis, bunların imanla öləcəklərindən də kinayə ola bilər."

Hədisdəki bayram gecələrindən məqsəd, Ramazan ayının son gününü bayrama bağlayan gecə və Ərəfə gününü Qurban bayramına bağlayan gecədir.

* * *

Ənəs b. Malik (رضى الله عنه) ‘dan rəvayət edildiyinə görə, o, belə demişdir:

Rəsulullah (ﷺ) bir neçə xurma yemədikcə, Ramazan bayramı günü (bayram namazına) çıxmazdı.

---------------

Bureydə (رضى الله عنه) ‘dan rəvayət edildiyinə görə, o, belə demişdir:

Rəsulullah (ﷺ) Ramazan bayramı günü (bir şey) yemədikcə (bayram namazına) çıxmazdı və Qurban bayramı günü, bayram namazından dönmədikcə (bir şey) yeməzdi.[1]

---------------

İzahı:

İlk hədisi, İmam Buxari (رحمه الله) və Tirmizi (رحمه الله) də rəvayət etmişlərdir.

İkinci hədisi, Tirmizi(رحمه الله), İmam Əhməd (رضى الله عنه), İbni Hibban (رحمه الله), Daraqutni(رحمه الله), Hakim (رحمه الله)və Beyhaqi(رحمه الله) də rəvayət etmişlərdir.

Tirmizi (رحمه الله) bu hədisləri rəvayət etdikdən sonra belə deyir:

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): “Ramazan bayramı günü (bayram namazına) çıxmadan əvvəl bir şey yemək haqqındakı bab”, hədis no: 1754, 1755, 1756

Elm əhlindən bir camaat Ramazan bayramı namazına çıxmadan əvvəl bir şey yeməyi və varsa, xurma yeməyi, müstəhəb saymışlardır.

Qurban bayramı günü də, namazdan dönmədikcə, bir şey yeməməyi müstəhəb saymışlardır.

Tuhfətu'l-Əhvəzi müəllifi- Mübarəkpuri isə, belə deyir:

Ramazan bayramı sabahı, bayram namazından öncə xurma ilə iftar etmək müstəhəbdir. Tapa bilməyənlər, bal kimi başqa şirniyyat yeməlidirlər. Heç bir çey tapa bilməyənlər, su içməlidirlər.

Qurban bayramı günü isə, qurban ətindən yemək üçün, bayram namazından dönənə qədər, bir şey yeməmək müstəhəbdir.

İmam Əhməd (رضى الله عنه) isə, müstəhəblik hökmünü, qurban kəsəcəklərə təhsis etmişdir (xas qılmışdır).

* * *

Səvbən (radiyallahu anh)'dan rəvayət edildiyinə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

"Kim Ramazan (orucunu tutar və) bayramdan sonra 6 gün oruc tutarsa, onun tutmuş olduğu oruc, ilin bütününün orucu olmuş olar.

Kim yaxşılıq edərsə, ona o yaxşılığın 10 misli vardır."

Not: Məcmə'uz-Zəvaid'də belə deyilmişdir:

Bu hədisi, ibni Hibban 'Səhih'ində rəvayət etmişdir.

İmam Sindi (əl-Hənəfi):

"Heysəmi, Məcməu'z-Zəvaid'də, bu hədisin səhih olduğunu söyləmək istəmiş və belə demişdir:

Bu hədisi dəstəkləyən şahid vardır."

---------------

Əbu Əyyub əl-Ənsari (radiyallahu anh)'dan rəvayət ediliyinə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

"Kim Ramazan orucunu tutar, sonra bunun arxasında Şəvval'dan 6 gün oruc tutarsa, onun tutmuş olduğu oruc, il boyunca tutulan oruc kimidir."

(İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu's-Siyam (Oruc kitabı): "Şəvval ayından 6 gün oruc tutmaq haqqında gələn hədislər babı", hədis no: 1715-1716)

---------------

İzahı:

Səvbən (radiyallahu anh)'ın hədisini, ibni Hibban da 'Səhih'ində rəvayət etmişdir. Darimi də bunun bənzərini rəvayət edir.

Əl-Mənhəl müəllifinin bəyanına görə, bu hədisin bənzəri- əbu Hureyrə, Cabir, Bəra b. Azib, ibni Abbas və Aişə'dən də rəvayət edilmişdir (Allah hamısından razı olsun).

Əbu Əyyub (radiyallahu anh)'ın hədisini- Əhməd, Muslim, Tirmizi, əbu Davud, Beyhaqi və Darimi də rəvayət etmişlərdir.

Əbu Əyyub (radiyallahu anh)'ın hədisinə görə, Ramazan orucundan sonra Şəvval ayından 6 gün oruc tutan kimsə, bütün il oruc tutmuş kimi savab qazanar. Çünki Ramazan ayı orucu, 10 qat artmaqla 10 aylıq oruca qarşılıq gələr.

(Yəni 30 gün Ramazan orucu 10 qat artmaqla 300 gün, yəni 10 aya qarşılıq gələr.)

Şəvval'ın 6 günlük orucu da 60 günlük oruca bərabər olar.

Səvbən (radiyallahu anh)'ın hədisinin zahirinə görə, Ramazan'dan sonrakı 6 günlük orucun Şəvval ayı içərisində olması şərt deyildir.

Bu hədisdə xatırlanan ayət, hər yaxşılığın 10 qatı veriləcəyini hökmə bağlamışdır.

"مَنْ جَٓاءَ بِالْحَسَنَةِ فَلَهُ عَشْرُ اَمْثَالِهَاۚ "

"Kim yaxşılıq edərsə, ona o yaxşılığın 10 misli verilər." (Ənam/160)

Ramazan orucundan ayrı olaraq Şəvval'ın xaricində belə 6 gün oruc tutularsa, bu ayətin hökmü gərəyincə, onun orucu, bütün ilin orucuna qarşılıq gələr.

Lakin hədisdəki: "...bayramdan sonra..." təbiri, Şəvval ayını xatırladır. Əbu Əyyub (radiyallahu anh)'ın hədisində də Şəvval qeydi mövcuddur.

O halda, bir an əvvəl, illik orucun savabını əldə etmək üçün Ramazanı izləyən Şəvval ayında bu 6 günlük oruc tutulmalıdır.

Əl-Mənhəl müəllifi, əbu Əyyub (radiyallahu anh) hədisini açıqlayarkən icmal olaraq belə deyir:

"Hədisin mənası budur:

Hər il Ramazan orucuna və Şəvval'ın 6 günlük orucuna davam edən kimsə, ömür boyunca oruc tutmuş kimi olur. Və bir il Ramazan orucunu və Şəvval'ın 6 günlük orucunu tutan bir kimsə, o il boyunca oruc tutmuş kimidir."

Bu hədis, Şəvval'ın 6 günlük orucunun müstəhəbliyinə dəlalət edir.

Şafii, Əhməd, Davud və bir camaat da belə hökn etmişlərdir.

Şəvval orucunun məşru olmasındakı hikmət budur:

"Bu oruc, fərz namazlara bağlı sünnətlərə bənzəyir. Sünnət namazlar, fərz olan namazlardakı bəzi

nöqsanlıqları təmir ettiyi kimi, Şəvval orucu da, Ramazan orucundakı bəzi qüsurları təmir edər."

Şafilərə görə, bayramın ikinci günü və ara verilmədən tutulması, daha savabdır. Əgər ara verilərək və ya Şəvval'ın digər hissələrində tutularsa, yenə sünnət hasil olar.

Əhmədə görə isə, fəzilət yönündən, ara verilərək və ya verilmədən tutulması, fərq etməz.

Əbu Hənifə, Malik və əbu Yusuf- Şəvval'ın 6 günlük orucunu, məkruh saymışlardır. Ta ki, xalq, bunun vacibliyinə inanmasın.

Malik, Muvatta'sında belə deyir:

"Elm və fiqh əhlindən, Şəvval'ın 6 günlük orucunu tutan kimsə görmədim. Sələftən də kimsənin tutduğuna dair, hər hansı bir məlumata rast gəlmədim.

Elm əhli, cahillərin Ramazan'dan olmayan orucu, Ramazana əlavə edərək bidət çıxaracaqlarından qorxaraq, bu orucu məkruh saymışlardır."

Lakin Hənəfi və Maliki məzhəbinə məxsus fəqihlər, Şəvval'ın bu orucunu, ara verərək tutmağı məndub saymışlar və ara vermədən tutulmağının isə, məkruh olmadığı görüşünü ixtiyar etmişlərdir.

Ancaq Hənəfilərdən imam Əbu Yusuf, bunda müxalif qalmışdır. Bu fəqihlər, əbu Hənifə və Malik'in yuxarıdakı kərahət sözlərini, Şəvval orucuna, bayramın ikinci günü başlayıb ara vermədən tutmaq halına görə izah etmişlərdir.

Bu halda, əgər bayramın ikinci günündən sonra və ara verərək tutularsa:

• kərahət yoxdur;

Və ya bu hədislər bu 2 imama:

• çatmamış;

• yaxud da çatmış, amma onlara görə hədis, sabit görülməmişdir.

* * *

## FİTRƏ ZƏKATINDA ÇIXARILACAQ MALIN CİNSİ.

Fitrə zəkatı qida olaraq bu dörd şeydən ödənər:

1. Buğda və yaxud buğda unu.

2. Arpa və yaxud arpa unu.

3. Xurma. Qəsd olunan oruc açarkən yeyilən xurmadır.

4. Kişmiş.

Bu ərzaqların yerinə qiymətlərini hesablayaraq pul şəklində ödəmək də caizdir. Çünki Allah Rəsulu (ﷺ) fitrə zəkatını əmr etdikdən sonra “Onları (yoxsulları) belə bir gündə möhtac olmaqdan xilas edin” buyurmuşdur.[1] Bu isə pulla da mümkündür.

İmam Əbu Yusuf (رحمه الله) belə deyir: “Mənə görə un şəklində vermək taxıl şəklində verməkdən daha yaxşıdır. Dirhəmlər (pul) şəklində ödəmək isə un şəklində ödəməkdən daha yaxşıdır. Çünki bu zəngin üçün daha asandır və yoxsulun ehtiyacını daha yaxşı ödəyir”.[2]

Çünki un taxıldan daha az zəhmətlidir. Taxılı üyütmək, xüsusən günümüzdə dəyirmana aparmaq hamısı əlavə xərcdir. Un isə hazır üyüdülmüş haldır. Pul şəklində ödəmək isə həm taxıl, həm də un şəklində ödəməkdən yaxşıdır. Çünki ola bilsin o yoxsulun undan və yaxud taxıldan başqa şeyə ehtiyacı var. Əgər əlində pulu olsa o

1 İmam Muhəmməd, Kitəbul Asl, 2/211-212.

2 Mövsili, əl İxtiyar li Təlilil Muxtar, 1/201.

ehtiyacını aradan qaldıra bilər. Hər yoxsul nəyə ehtiyacı olduğunu özü daha yaxşı bildiyi üçün ona fitrə zəkatını pul olaraq vermək ən uyğun olanıdır. Bu yolla yoxsul da özü istədiyi şəkildə ehtiyacını aradan qaldırar.

Bu bolluq anında bu cürdür. Əgər mağazalarda və bazarlarda bolluq olarsa pul olaraq vermək daha yaxşıdır. Lakin əgər qıtlıq olarsa sadalanan ərzaqlar şəklində vermək daha yaxşıdır. Çünki qıtlıq olduğu zaman yoxsul birisi ərzaq tapmaya da bilər.

Burada bir hikmətə də toxunmaq istəyirəm. Bilindiyi kimi fitrə zəkatının cinsi bütün hədislərdə pul olaraq deyil, ərzaq olaraq təyin edilib. Əgər pulla təyin edilsəydi pulun qiyməti əsrdən-əsrə dəyişdiyi üçün o zamankı miqdar indiki ehtiyacı ödəmək üçün kifayət etməyə bilərdi. Lakin ərzaqla təyin edildiyi zaman pul nə qədər ucuzlaşır ucuzlaşsın yenə ərzağa yetəcək miqdarda verilməlidir.

Fitrənin pul şəkilində çıxarılmasının caiz olduğunu deyənlər Hənəfilər və tabiinlərdən Həsən əl-Bəsri (رحمه الله), Ömər ibni Abdulaziz (رحمه الله), Süfyan əs Səvri (رحمه الله), Ata bin Rəbah (رحمه الله) və həmçinin bir digər görüşə görə İmam Əhməddir[1] (رضى الله عنه) Bundan əlavə olaraq ehtiyac və məsləhət gərəyi olaraq İbn Teymiyyədə (رحمه الله) fitrə zəkatının pul şəklində verilməsinin caiz olduğunu söyləmiş və seçmiş olduğu görüşdə budur.Bu

1 əl-Hidayə, 1/109; əl-Məcmuu, 6/144; əl-Muğni, 3/87; Məcmuul Fətava, 2/79, 82.

həmçinin İmam Əhmədin (رضى الله عنه) məzhəbindəki görüşlərdən biridir.[1]

Bundan əlavə olaraq Tavus (رحمه الله), Mücahid (رحمه الله), Said ibn Musəyyəb (رحمه الله), Urvə ibn Zübeyr (رحمه الله), Əbu Səlmə ibn AbdurRahman ibn Avf (رحمه الله), Said ibn Cubeyr (رحمه الله), Əbu İshaq (رحمه الله), İbn Əbi Şeybə (رحمه الله) və.s

Eyni şəkildə bu görüş Şam əhlinin fəqihi İmam Əvzai (رحمه الله), Misir əhlinin fəqihi Leys ibn Sad (رحمه الله), İraq əhlinin fəqihi Süfyan Əs- Səvrinin (رحمه الله) görüşüdür. Bu eyni şəkildə Müaviyənin (radiyallahu anhu) görüşüdür. Bu məsələdə istəyənlər İbn Əbi Şeybənin (رحمه الله) "Musannəf" əsərinə baxıb fətvalara nəzər sala bilərlər.

* * *

1 Məcmuul Fətava, 2/79, 82

Əl-Minhal (رضى الله عنه) belə demişdir: Rəsulullah (ﷺ) hər ayın 13,14,15-ci günlərinin orucunu əmr edər və: O (oruc) daim oruc tutmaq kimi və ya daim oruc tutmaq vəziyyəti kimidir.buyururdu.

Qatadə b. Melhan əl-Qaysidən (رضى الله عنه) rəvayət edildiyinə görə, Peyğəmbər (ﷺ) bunun mislini buyurmuşdur.

İbn Macə (رحمه الله) dedi ki: Həmmam, isabətli rəvayət etmişdir.[1]

İzahı:

Əbu Davud (رحمه الله), Əhməd (رحمه الله) və Beyhaqi (رحمه الله) də bu hədisi Həmmam sənədilə Qatadə'dən rəvayət etmişlərdir.

Hədisin açıqlaması ilə bağlı olaraq əl-Mənhəl əsərinin müəllifi belə deyir:

"Yəni, Peyğəmbər (ﷺ) hər qəməri ayın 13, 14, 15-ci günlərinin orucunu müstəhab olmaq üzərə bizə əmr edərdi. Bu 3 günün gecələrinə 'bəyaz gecələr' ismi verilmişdir. Çünki bu 3 gecədə ay işığı, axşam namazı vaxdından sabaha qədər davam edir. Və bütün gecə aydınlıq olur.

Hədis, hər ayın zikr edilən günlərində tutulan orucun savabının, ilin tamamını orucla keçirtmə savabı kimi

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu's-Siyam: Hər aydan 3 gün oruc tutmaq haqqında gələn hədislər babı, hədis no: 1707

olduğunu bildirir. Çünki hər yaxşılıq, 10 misli ilə artar. 3 günlük oruc savabıda 30 günlük oruca bərabər olar.

---------------

Əbu Zərr (رضى الله عنه)dan rəvayət edildiyinə görə, Rəsulullah (ﷺ) belə buyurmuşdur: Bir kimsə, hər aydan 3 gün oruc tutarsa, o, davamlı orucdur.

Allah (azzə və cəllə) kitabındaki: Kim bir yaxşılıq edərsə, ona o yaxşılığın 10 qatı verilər.” (Ənam/160) ayəti ilə, bunun təsdiqini endirmişdir. Belə olduğu halda, hər gün (orucu) 10 gün (orucuna) bərabərdir.”[1]

Muaza əl-Adəviyyə (رضى الله عنه)dan rəvayət edildiyinə görə, Aişə anamız deyərdi: Allah rəsulu (ﷺ) hər aydan 3 gün oruc tutardı.

Mən: Ayın hansı qismindən (tutardı?)” deyə soruşdum.

Aişə anamız belə cavab verdi: O, ayın hansı qismindən olduğuna əhəmiyyət verməzdi.[2]

İzahı:

Əbu Zərr (رضى الله عنه) in hədisini Tirmizi (رحمه الله) də rəvayət etmişdir.

Muaza (رضى الله عنه)nın hədisini Muslim(رحمه الله), Əbu Davud(رحمه الله), Tirmizi(رحمه الله) və Beyhaqi (رحمه الله) də rəvayət etmişlərdir.

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam, hədis no: 1708)

2 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam, hədis no: 1709)

Əbu Zərr (رضى الله عنه)in hədisinə görə, hər ayın başından, ortalarından və ya sonundan 3 gün oruc tutan kimsə, bütün ilin orucunu tutmuş kimi olur. Tutulan bu 3 günlük orucun, bundan əvvəlki Qatadə hədisində anılan günlərdə olması qeydi yoxdur.

Hər yaxşılığın 10 qat artırılacağı hədisdə anılan ayətlə sabit olduğundan, hər aydan 3 gün oruc tutularsa, bütün ay orucla orucla keçirilmiş kimi savab olur.

Muaza (رضى الله عنه) nın hədisində, Peyğəmbər (ﷺ) hər aydan 3 gün oruc tuttuğu və bu günlərin, ayın müəyyən bir hissəsinə bağlı olmadığı göstərilməktədir.

Bu hədislər, tutulacaq 3 günlük orucun, ayın müəyyən günlərinə təhsis edilməsinin məkruhluğuna hökm edən Malikilərin dəlillərindəndir.

Əl-Mənhəl əsərinin müəllifi:

Bu hədislər ilə bundan əvvəlki hədisin arasını birləşdirmək üçün, belə demək mümkündür:

Peyğəmbər (ﷺ) Qatadə (رضى الله عنه) ın hədisindəki günlərə bağlı qalmayaraq sair günlərdə də oruc tutardı ki, belə etməklə də sünnətin yerinə gətirilməsinin mümkün olduğu bilinsin.

Və yaxud Peyğəmbər (ﷺ) in bəzi məşğuliyyətləri yaranardı. Buna görə də, 3 günlük orucu, ayın başqa günlərində tutardı.

Xülasə olaraq, bütün rəvayətlərdən çıxan nəticə budur ki:

Hər ayın 13, 14, 15-ci günlərində oruc tutmaq müstəhabdır və hər ayın başlarından olsun, ortalarından olsun, sonlarından olsun, 3 gün oruc tutmaq müstəhabdır.”

* * *

Allah Rəsulu ( ﷺ ) Zilhiccə ayının ilk doqquz gününü, Aşura günü, hər aydan üç gün və hər ayın bazar ertəsi  və cümə axşamı günləri oruc tutardı” [Nəsai, Əbu Davud] Allah qatında Zilhiccə ayının ilk on günlüyündə edilən saleh əməllər əməllərdən daha fəzilətlisi yoxdur. Bu günlərdə təsbihi, təhmidi, təhlili və təkbiri çoxaldın” [Təbərani]

Təsbih – SunhanAllah (سبحان الله)

Təhmid - Əlhəmdulilləh (الحمد لله)

Təhlil - La İləhə İlləllah (لا اله الا الله)

Təkbir - Allahu Əkbər (الله اكبر)

Bu hədis Zilhiccə ayının ilk on günlüyünün ilin digər günlərindən daha üstün olduğunu göstərir. Bu üstünlük Ramazan ayının son on günü də daxil istisnasız bir şəkildə bütün ilin günlərindən daha üstündür. Ramazan ayının son on gecəsi Zilhiccə ayının ilk on günündən daha fəzilətlidir. Çünki Ramazanın son on gecəsində min aydan daha üstün olan Qədr gecəsi vardır. [ İbn Kəsir Təfsiri 5/412]

Əbu Dərda (رضى الله عنه) buyurur ki: "Zilhiccənin ilk 9 günü oruc tutmalı, çox sədəqə verməli, çox dua edilməlidir. Çünki Allah Rəsulu bu on günün xeyir və bərəkətindən məhrum qalana yazıqlar olsun." deyə buyurdu.

Allah (azzə və cəllə ) bu ayı ihya edən qullarından etsin və qısa müddət ərzində məscidləridə üzümüzə açsın. Amin

* * *

Abdullah b. Abbas (radiyallahu anh)'dan belə rəvayət edilir: Allah rəsulu (sallallahu aleyhi və səlləm): "İçində olduğunuz bu günlər (yəni Zilhiccə'nin ilk 10 günün) dəki saleh əməldən, Allah qatında daha sevimli (saleh əməlin olacağı) başqa günlər heç yoxdur." buyurdu. (Səhabələr): "Ey Allahın rəsulu! Allah yolunda cihad da mı (daha sevimli deyildir)?" diyə soruşdular. O: "(Bəli) Allah yolunda cihad da. Məgər ki, bir adam nəfsi və malı ilə cihada çıxıb, özünə aid mal və nəfisdən heç bir şeyi geri gətirə bilməsə. (Yəni onun bu əməli, bu 10 gündəki əməldən daha fəzilətli olar)." buyurdu. ----------------------- Əbu Hureyrə (radiyallahu anh)'dan rəvayət edildiyinə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur: "Bu 10 gündə Allah Subhənəhu'ya edilən ibadətdən, Ona daha sevimli ibadətin ediləcəyi günlər, dünya günləri içərisində yoxdur. Və şübhəsiz, o günlərdəki bir günün orucu, bir ilin orucuna və onlarda-

kı bir gecə, Qədr gecəsinə şübhəsiz bərabər olar." İbn Macə, Sünən tərcümə və şərhi, "Kitabu's-Siyam (Oruc kitabı): (Zilhiccə'nin ilk) 10 gün orucu (haqqındakı hədislər) babı", hədis no: 1727, 1728 ------------------------- İzahı:İbn-i Abbas (radiyallahu anh) hədisini, Buxari, əbu Davud, Tirmizi və Beyhaqi də rəvayət edirlər. Əbu Hureyrə (radiyallahu anh) hədisini, Tirmizi də rəvayət etmişdir. Zilhiccə'nin ilk 10 günündən məqsəd, ilk 9 gündür. Çünki 10-cu gün, Qurban bayramıdır. Qurban bayramı günü oruc tutmaq isə, haramdır. Bu 2 hədis, bu 10 gündə edilən hər cür ibadətin, ilin digər günlərində edilən ibadətlərdən daha fəzilətli olduğuna dəlalət edirlər. Oruc da bir ibadət olduğu üçün, bu günlərdəki orucun üstün fəzilətinə də dəlalət etmiş olur.

İkinci hədis, bu günlərdəki bir günlük orucun, bir illik oruca və bir gecəsindəki ibadətin, Qədr gecəsindəki ibadətə bərabər olduğuna dəlalət edir. "Əl-Mənhəlu'l-Azbi'l-Məvrud şərh-u Sunən-i əbu Davud" əsərinin müəllifi- Mahmud Muhamməd Xattab əs-Subqi (rahmətullahi aleyh), ilk hədisin açıqlaması ilə bağlı olaraq icmalən belə deyir: "Hədisdən məqsəd budur ki, bu günlərdə işlənən saleh əməllər elə uca əcr qazandırır ki, o əməllər başqa günlərdə işlənərsə, bu qədər savab qazandıra bilməz. Başqa günlərdə işlənəcək əməl, cihad belə olsa, hal eynidir. Ancaq bir adam, nəfsi və malı ilə Allah yolunda döyüşə çıxıb şəhid olar və malı Allah yolunda xərclənmiş olduğu təqdirdə, onun savabı daha çoxdur." Möhtəmələn hədisdən məqsəd budur: Bu günlərdə işlənən saleh əməl az belə olsa, sair zamanlarda işlənən

çox əməldən əfdaldır (fəzilətlidir). "Tuhfətu'l-Əhvəzi" əsərinin müəllifi Mübarəkpuri, ikinci hədisin açıqlaması bəhsində belə deyir: "Yəni bu günlərdə tutulan bir günlük nafilə oruc, içində bu günlərin olmadığı bir illik oruca bərabərdir. İçində Ramazan ayının olmadığı bir il deməyə gərək yoxdur. Çünki onun orucu fərzdir." İmam əbu'l-Həsən əs-Sindi (əl-Hənəfi), belə deyir: Hədisdəki "...10 gün orucu..." ifadəsindən məqsəd, 9 gündür. Çünki 10-cu gün, Qurban bayramıdır. Və onda oruc tutula bilməz." Tuhfə müəllifi əl-Mirqat'dan nəqlən belə deyir: "Alimlər, bu 10 gün ilə Ramazan ayının son 10 günündən hansının daha fəzilətli olduğu xüsusunda ixtilaf etmişlərdir. Bəziləri bu hədisə istinadən, bu günlərin, Ramazan'ın son 10 günündən daha fəzilətli olduğunu söyləmiş; Bəziləri də Ramazan'ın son 10 gününün bu günlərdən daha fəzilətli olduğunu söyləmişlərdir.

Daha seçkin görüş: Bu 10 günün gündüzünün, Ramazan'ın son 10 gününün gündüzündən daha fəzilətli olmasıdır. Çünki bu günlərin içində Ərəfə günü vardır. Gecələrə gəlincə isə: Ramazan'ın son 10 gecəsi, bu günlərin gecələrindən daha fəzilətlidir. Çünki içlərində Qədr gecəsi vardır. Ərəfə günü, ilin ən fəzilətli günüdür. Qədr gecəsi də, ilin ən fəzilətli gecəsidir."

* * *

Əbu Hureyrə (radiyallahu anh)'dan belə rəvayət edilir:

Bir adam Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in yanına gələrək:

"Ramazan ayından sonra hansı oruc əfdaldır (fəzilətlidir)?" diyə soruşdu. O:

"Məhərrəm dediyimiz Şəhrullah (Allahın ayında tutulan oruc)" buyurdu.

İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu's-Siyam (Oruc kitabı): "Haram aylar orucu babı", hədis no: 1742

------------------------

İzahı:

Muslim, əbu Davud, Tirmizi, Beyhaqi və Darimi də bunu rəvayət edirlər.

Hədisin zahirinə görə, Məhərrəm ayının bütünü qəsd edilmişdir. Tirmizi'nin Əli (radiyallahu anh)'dan rəvayət etdiyi bu hədis də, bunu təyid edər (qüvvətləndirər):

Əli (radiyallahu anh), Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in yanında oturmuş ikən, bir adam Allah rəsulu (sallallahu aleyhi və səlləm)'ə:

"Ey Allah'ın rəsulu! Ramazan ayından sonra hansı ay oruc tutmağımı əmr edirsən?" diyə soruşur. Allah rəsulu da:

"Əgər Ramazan ayından sonra oruc tutacaqsansa, Məhərrəmi tut. Çünki o, Allah'ın ayıdır." buyurmuşdur.

“Əl-Mənhəl Azbi’l-Məvrud şərh-u sunən-i əbu Davud” müəllifi- Mahmud Muhamməd Xattab əs-Subqi’nin bəyanına görə, hədisdən məqsəd:

“Məhərrəm ayı içərisində, yəni bir qismində oruc tutmaq və ya bu ayda yer alan Aşurə günü orucu tutmaq ola bilər.”

---------------------

Hüccətü’l-İslam imam Ğazzali (rahmətullahi aleyh), hədisin izahı sədədində belə deyir:

“Çünki Məhərrəm ayı, hicri ilin başlanğıcıdır. İlin ilk gününü belə bir xeyirli əmələ dayanadırmaq həm xoş, həm də bərəkətinin mütəmadiliyini təmin etməyə vəsilə olur.” (İmam Ğazzali, “İhya’u-Ulumi’d-din”, 1. Cild, 6. Kitab/3. Bölmə: Nafilə oruclar”, s. 561)

* * *

1733- Aişə (radiyallahu anha)’dan belə rəvayət edilir:

“Rasulullah (sallallahu aleyhi və səlləm), Aşurə günü oruc tutar və o gün oruc tutmağı əmr edərdi.”

--------------------

1734- ibni Abbas (radiyallahu anh)’dan belə rəvayət edilir:

Allah rəsulu (sallallahu aleyhi və səlləm), Mədinəyə hicrət etdikdən sonra, oradakı yəhudiləri (aşurə günü) oruclu olaraq gördü.

Və: “Bu, nə orucdur?” diyə soruşdu.

Yəhudilər:

“Bu gün Allah, Musanı (düşmənlərindən) qurtardığı və Fironu boğdurduğu gündür. Musa (əleyhissəlam), (Allahın bu ehsanına) şükür olaraq, bu gün oruc tutmuşdur.” dedilər.

Allah rəsulu (sallallahu aleyhi və səlləm):

“Biz Musa(nın sünnətini ihya)’ya sizdən daha yaxın və haqq sahibiyik.” buyurdu. Və o gün oruc tutdu. O gün oruc tutmağı da əmr etdi.”[1]

-------------------------

İzahı:

1733 no- lu Aişə (radiyallahu anha) hədisini, Kütübü’l-Sittə sahibləri (Buxari, Muslim, Tirmizi, əbu Davud, ibn Macə və Nəsai), Beyhaqi və Darimi də uzun və qısa mətinlər halında rəvayət etmişlərdir. Uzun olan rəvayətlərdə Aişə (radiyallahu anha)’dan icmal olaraq belə buyurulur:

“Aşurə günü, Qureyşin, cahiliyyə dövründə orucla keçirdiyi bir gündür. Allah rəsulu (sallallahu aleyhi və səlləm) də, Peyğəmbərlik və ya hicrətdən əvvəl, o gün oruc tutardı.

Mədinəyə hicrət etdikdən sonra da aşurə orucuna davam etdi. Və o gün oruc tutmağı əmr etdi. Ramazan

1 İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): “Aşurə günü orucu babı”

orucu fərz qılındığında, artıq fərz oruc, Ramazan orucu oldu. Və Aşurə orucunu tərk etdi. Artıq istəyən, Aşurə orucunu tutdu, istəməyən tutmadı.”

“əl-Mənhəl Azbi’l-Məvrud şərh-u Sunən-i əbu Davud” müəllifi- imam Mahmud Muhamməd Xattab əs-Subqi, bu hədisin açıqlaması bəhsində icmal olaraq belə deyir:

“Bu hədisin zahiri, Aşurə günü orucunun, ilk zamanlarda vacib olduğuna, sonra Ramazan orucunun fərz qılınması ilə, onun vacibliyinin nəsx edildiyinə dəlalət edir.

Əbu Hənifə və Şafi’nin əshabından bir camaat, bununla hökm etmişlərdir.

Bir qisim Şafi alimləri:

Aşurə orucu məşru qılındığı gündən bəri sünnətdir. Bu ümmətə heç vacib qılınmamışdır. Lakin ilk zamanlarda çox əhəmiyyətli müstəhəb idi. Ramazan orucu fərz qılınınca, o müstəhəb oldu.”

Birinci görüş, daha qüvvətlidir.

---------------------

1734 no- lu İbn-i Abbas (radiyallahu anh) hədisini, Tirmizi’dən başqa Kütübü’l-Sittə sahibləri və Beyhaqi də bənzər ləfzlərlə rəvayət etmişlərdir.

Allah rəsulu (sallallahu aleyhi və sələm), Rəbiu’l-Əvvəl ayında Mədinəyə hicrət etmiş və hicrətin 2-ci ili Aşurə günü yəhudilərin oruc tutduğunu görmüşdür.

Peyğəmbər (sallallahu aleyhi və səlləm), Musa (əleyhissəlam)'a, yəhudilərə nisbətən çox daha yaxın olduqlarını, Musa (əleyhissəlam)'ın sünnətini ihya etməyin, ilk əvvəl özlərinin haqqı olduğunu bildirmişdir.

Çünki biz Müsəlmanlar, Musa (əleyhissəlam)'ın kitabına inanırıq. Və dinin təməl hökmlərində bizim kitabımız ilə Musa (əleyhissəlam)'ın əsl kitabı arasında bir ayrılıq yoxdur. Onun üçündür ki, Allah Taala, Peyğəmbərimizə:

أُولَـٰٓئِكَ ٱلَّذِينَ هَدَى ٱللَّهُ ۖ فَبِهُدَىٰهُمُ ٱقْتَدِهْ...

"Bunlar Allahın doğru yola yönəltdiyi kəslərdir. Sən də onların haqq yoluna yönəl..." (Ənam/90) buyurmuşdur.

----------------

Belə bir sual xatirə gələ bilər:

"Yəhudilər kafir olduqları üçün, verdikləri xəbərlər rədd edilməyə məhkumdur.

Bununla bərabər, Allah rəsulu (sallallahu aleyhi və səlləm), onların verdiyi xəbəri doğrulamış olmur mu?"

Buna belə cavab verərik:

• Yəhudilərin verdikləri xəbərlərin doğruluğu, gələn bir vəhylə doğrulanmış ola bilər; vəya

• Onlardan İslamı qəbul edən Abdullah b. Səlam (radiyallahu anh) kimi şəxslər tərəfindən xəbər verilmiş ola bilər; yaxud da

• Bu xəbər, ən balaca bir şübhəyə yer buraxmayacaq tərzdə, təvatür[1] həddinə çatmış çox kimsə tərəfindən bildirilmiş ola bilər.

* * *

İbn-i Abbas (radiyallahu anh)'dan rəvayət edildiyinə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

"(And olsun) Əgər Mən, gələcək ilə qədər sağ qalacaq olarsam, Məhərrəm ayının 9-cu günü oruc tutacam."

Əbu Əli demişdir ki:

Əhməd b. Yunus, bu hədisi, ibn əbi Zi'b'dən rəvayət edərək, bu əlavəni etmişdir:

Aşurə gününü qaçırmaq qorxusu ilə (Peyğəmbər sallallahu aleyhi və səlləm) belə buyurmuşdur.

İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu's-Siyam (Oruc kitabı): "Aşurə günü orucu babı", hədis no: 1736

-------------------

İzahı:

Bu hədisi, Muslim, əbu Davud, Beyhaqi də rəvayət etmişlərdir. Muslim və əbu Davud'un rəvayətlərində, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in işarət

1 Təvatür: Yalan üzərində birləşmələri mümkün olmayan bir topluluğun verdiyi xəbər.

buyurduğu gələcək ilə çatmadan vəfat etdiyi əlavəsi vardır. Lakin Əhməd b. Yunus'un əlavəsi yoxdur.

Allah rəsulu (sallallahu aleyhi və səlləm): "Gələcək il (Məhərrəmin) 9-cu günü oruc tutarıq." buyurarkən; Aşurə olan 10-cu gün yerinə 9-cu gün tutarıq demək istəmiş ola bilər.

Və ya Aşurə günü ilə bərabər 9-cu günü də orucla keçirərik, demək istəmiş ola bilər. Çünki Əhməd'in, ibni Abbas (radiyallahu anh)'dan mərfu olaraq rəvayət etdiyi bir hədisdə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

صوموا يوم عاشوراء وخالفوا اليهود صوموا يوما قبله أو يوما بعده

"Aşurə günü orucu tutun və yəhudilərə müxalifət edin. Aşurədən bir gün öncə və ya bir gün sonra oruc tutun."

Hər 2 izahda da, yəhudilərə və xristiyanlara müxalifət vardır.

Əhməd b. Yunus'un rəvayətindəki əlavəyə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm), Aşurə gününün fəzilətini qaçırmamaq məqsədi ilə və ehtiyatlı davranmaq üzərə, Aşurə günündən bir gün əvvəl oruc tutmağa başlamaq istəmişdir. Yəni hilalın təsbitində bir yanılma ola bilər və Aşurə günü sanılan gün, Məhərrəm'in 11-ci günü ola bilər. Bu halda, əsl Aşurə günü qaçırılmış olar. Bir gün əvvəldən oruca başlamaq ehtiyatlı olar.



* * *

Abdullah b. Ömər (b. əl-Xattab) radiyallahu anh'dan belə rəvayət edilir:

Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in yanında Aşurə günündən bəhs edildi. Bunun üzərinə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurdu:

"Aşurə günü, cahiliyyə əhlinin oruc tutduğu bir gündür. Artıq sizdən o gün oruc tutmaq istəyən tutsun və o gün oruc tutmaq istəməyən də, o günün orucunu tərk etsin."

İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu's-Siyam (Oruc kitabı): "Aşurə günü orucu babı", hədis no: 1737

----------------------

İzahı:

Muslim, əbu Davud, Tahavi və ibn-i Xuzeymə də, bunu bənzər ləfizlərlə rəvayət etmişlərdir.

Hədisdən məqsəd budur:

Aşurə günü orucu, vacib deyildir. Məqsəd bu olunca, bu hədis, Aşurə günü orucunun fəzilətinə aid olub, bundan sonra gələn əbu Qatadə (radiyallahu anh) hədisinə və bənzəri hədislərə tərs düşməz.

əl-Hafiz, "əl-Fəthu'l-Bari"də belə deyir:

"Aşurə günü orucu haqqında gələn hədislərin bütünündən alınan nəticə budur:

• Bu günün orucu üçün əmr verdildiyində, ilk vaxtlar, vacib idi.

• Sonra bu əmr, təkid edildi.

• Daha sonra elan edilmək surətilə verilən əmr, daha da qüvvətləndirildi.

• Daha sonra verilən bir əmrlə, o gün oruc tutmamış olanların, günün qalan qismini oruclu keçirmələri və əmzikli qadınların uşaqlarını o gün axşama qədər əmzirməmələri buyurulmaqla, əhəmiyyəti daha da arttırıldı.

• Ən son Ramazan orucu fərz qılındığında, Aşurə günü orucu tərk edildi.

Amma müstəhəbliyinin tərk edilmədiyi bilinirdi. Bu halda tərk edilən şey, Aşurə orucunun vacibliyidir, şiddətli müstəhəbliyi deyildir. Bəzi alimlər:

Onun şiddətli müstəhəbliyi tərk edilmiş, normal müstəhəbliyi qalmış, demişlərsə də, bu görüşün zəifliyi açıqdır. Əksinə, müstəhəbliyinin şiddəti əbədidir. Hələ Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in vəfatına qədər bu oruca verilən əhəmiyyətin davam etməsi və Onun :

'Əgər yaşayacaq olarsam, gələcək il 9-cu və 10-cu gün oruc tutacam.' buyurması və Aşurə orucunun bir illik günahlara kəffarə olduğunu bildirməklə, müsəlmanları təşviq etməsi, bunun müstəhəbliyinin şiddət dərəcəsinin davamına açıq dəlildir."



* * *

Əbu Qatadə (radiyallahu anh)’dan rəvayət edildiyinə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

“Şübhəsiz, Allahın Aşurə günü orucu ilə ondan öncəki il(in günahların)ı bağışlamasını umuram.”

İbn Macə, Sünən tərcümə və şərhi, Kitabu’s-Siyam (Oruc kitabı): “Aşurə günü orucu babı”, hədis no: 1738

--------------------------

İzahı:

Muslim, Tirmizi, Nəsai və Əhməd də bunu rəvayət etmişlərdir.

Tuhfə müəllifi belə deyir:

Nəvəvi:

“Hədisdən məqsəd, kiçik günahların bağışlanmasıdır. Əgər kiçik günahlar yoxdursa, böyük günahların xəfiflədilməsi umulur. O da yoxsa dərəcələr yüksəldilir.” demişdir.

Qadı İyad da belə deyir:

“Əhli Sünnətin məzhəbi budur. Böyük günahlara gəlincə, onlar ya məqbul bir tövbə ilə və ya Allahın rəhməti ilə bağışlanar.”

* * *